M.Ə.Rəsulzadənin oxuculara təqdim etdiyimiz bu kitabına onun Bakı və Azərbaycan tarixi ilə əlaqədar Cümhuriyyətin varlığının ilk ilində yazdığı əsərləri daxil edilmişdir. Onlardan biri Bakı hələ azad edilməmişdən, 1918-ci ilin sentyabrından əvvəl İstanbulda nəşr olunan "Tərcümani-həqiqət" qəzetində Bakı ilə əlaqədar verdiyi bəyanat, 1918-ci il noyabrın əvvəllərində İstanbuldan vətənə döndükdən sonra, 1918-ci il dekabrın 2-dən başlayaraq "Azərbaycan" qəzetində "Azərbaycan paytaxtı" sərlövhəsi ilə dərc olunan elmi araşdırmaları, habelə müstəqil dövlətimizin Azərbaycan adlanması ilə əlaqədar İran iddialarına cavab olaraq yazdığı "İran və biz", "Azərbaycan və İran", "İran – Azərbaycan" sərlövhəli məqalələri, həmçinin Cümhuriyyətin bir illiyi ilə əlaqədar "İstiqlal" məcmuəsində dərc olunmuş "Azərbaycan Cümhuriyyəti" adlı əsəri daxil edilmişdir.

Zənnimizcə oxucular üçün faydalı olacaqdır.

Araşdırıb toplayanı, ərəb əlifbasından
latın qrafikasına çevirəni, ön sözün müəllifi,
lüğətin tərtibçisi:
**Şirməmməd Hüseynov**

Transliterasiyanın redaktorları:
**prof. Şamil Vəliyev,**
**elmi işçi Samir Xalidoğlu (Mirzəyev)**

Redaktor:
**f.ü.f.d. Aygün Əzimova**

**M.Ə.Rəsulzadə**
**Bakı və Azərbaycan tarixinə dair əsərlər (1918-1919)**
Bakı, Qanun Nəşriyyatı, 2013, 160 səh.

Qanun Nəşriyyatı
Bakı, AZ 1102, Tbilisi pros., II Alatava 9
Tel: (+994 12) 431-16-62; 431-38-18
Mobil: (+994 55) 212 42 37
e-mail: info@qanun.az
www.qanun.az

ISBN 978-9952-26-579-8

## Ön söz

Milli müstəqillik, milli paytaxt, milli bayraq, milli dövlət xalqların arzu etdikləri və nail olmaq istədikləri ən böyük və müqəddəs nemətdir. 1923-c ildə M.Ə.Rəsulzadənin İstanbulda "Azərbaycan Cümhuriyyəti" kitabı işıq üzü görmüşdür. Bu nəşr ilə Türkiyə Cümhuriyyətinin qurucusu Mustafa Kamal Paşa da tanış olmuşdur. O demişdir: "Mən dünyaya səndən üç sənə erkən göz açmışam, ancaq bütün Türk aləmində Türkün istiqlal bayrağını sən qaldırmısan və bayraq enməsin deyə mən sənin əlindən alıb Türkiyə üzərində dalğalandırmışam. Enməz demisən bu bayraq, enməyəcəkdir!"

Məlumdur ki, 1918-ci il mayın 28-də Tiflisdə Azərbaycan Xalq Cümhuriyyətinin yaradıldığı elan edilmişdi. Müstəqilliyin elanı əgər millətin əksəriyyəti tərəfindən rəğbətlə qarşılanmışdısa, onun əleyhinə çıxanlar da az olmamışdı. Xüsusilə, Bakıda hakimiyyəti ələ keçirmiş bolşevik-daşnaq güruhi, ona qoşulan bolşevik hümmətçilər, şovinist ruslar, həmçinin İran rəsmiləri bu tarixi aktı qəbul etmək istəmirdilər.

M.Ə.Rəsulzadənin yazdığı kimi "Azərbaycan istiqlalının düşmənləri dostlarından çox idi. Türk olmayan bütün rus firqələri və rus təmayülündə olan digər xristian firqələr bu fikrə tamamilə əks idilər. Rus burjua firqələri Bakı sərvətindən əl çəkmək fikrilə heç bir növlə ülfət edə bilmirdilər"

"Azərbaycan" qəzetinin Bakıda nəşr olunmağa başlayan 3 oktyabr tarixli 5-ci nömrəsində "Bakı məsələsinə dair müla-qat" sərlövhəli bir yazı dərc edilmişdir. Məqalədə oxuyuruq: "Bakı alınmamışdan əqdəm bizim bədxahlarımız tərəfindən Bakını Azərbaycandan ayırmaq üçün cürbəcür vasitələr, dürlü-dürlü hiylələr aranıyordu".

Tiflis saxta sosialist vərəqələri və erməni qəzetləri "Bakı Azərbaycanın olmuyub "sərbəst" şəhər (volnı qorod) olsun şüarını təbliğ edirdilər. Avropa siyasi dairələrinin diqqətini də Bakı məsələsinə cəlb etmək istəyirdilər. Həmin məsələ xüsusunda İstanbulda nəşr edilən "Tərcümani-həqiqət" qəzetəsi mühərrirlərindən birini İstanbulda olan Azərbaycan nümayəndə heyətinin sədri M.Ə.Rəsulzadənin yanına göndərmiş, ondan bəyanat istəmişdi. Biz həmin bəyanatı da kitabçaya daxil etmişik. "Bakı Azərbaycanın, Azərbaycan da Bakınındır. Bakını Azərbaycandan ayırmaq istəyən kim olursa-olsun Azərbaycanın həyatına qəsd etmişdir. Bakısız Azərbaycan təsəvvür olunamaz" – M.Ə.Rəsulzadənin hökmü belə idi.

Hətta M.Ə.Rəsulzadənin təəssüflə yazdığı kimi "müsəlman sosialistlərin ələmdarı bulunan "Hümmət" firqəsi başda doktor Nəriman olmaq üzrə Azərbaycan muxtariyyətinin ən güclü düşməni (ədüvv-canı) idilər. "Hümmət"ə görə guya istiqlalçılar milləti fəlakətə çəkir". Azərbaycan fikri türklük iddiaları xəlqin degil, bir takım burjuapərəst "boşboğaz"ların imiş. Müsəlmanların mənfəəti "qırmızı əmələ bayrağının" al-

tına toplanmaq və "Rusiya demokratiyasından ayrılmamaq imiş". İslamçıların nəzərində də müsavatçılar haqsiz idilər. O zamankı "Rusiyada müsəlmanlıq" istiqlal tərəfdarlarını təfriqəçilikdə, milləti-islamı parça-parça eləməkdə ittiham edirdilər.

Fəqət müsavatçılar bütün bu hücumlara, bütün bu ittihamlara rəğmən: Yaşasın Azərbaycan! deyirdilər.

Məlumdur ki, 1918-ci il avqustun 27-də Almaniya ilə Sovet Rusiyası arasında Türkiyədən gizli bir saziş imzalanmışdı. Onun 6-cı fəsli Qafqaza aid idi. Saziş ilk növbədə Azərbaycan Cümhuriyyətinin ərazi bütövlüyünə qarşı yönəlmişdi. Belə ki, Almaniya Bakının Sovet Rusiyası tərkibində qalmasının tərəfdarı idi. Bir şərtlə ki, Rusiya hər ay çıxarılan neftin dörddə bir hissəsini Almaniyaya versin. İstanbul mətbuatında bu gizli saziş barədə məlumat verildi. Sentyabrın 1-də İstanbulda olan Azərbaycan nümayəndə heyətinin başçısı M.Ə.Rəsulzadə Azərbaycan xarici işlər naziri M.H.Hacınskiyə bu barədə xüsusi məktub göndərmişdi. Orada deyilirdi: "Berlindən alınan məlumatlara görə bolşeviklərlə Almaniya arasında əlavə müqavilə imzalanmışdır. Qafqaz dövlətlərindən bolşeviklər yalnız Gürcüstanın müstəqilliyini tanımışlar və almanlar isə Bakıda çıxarılan neftin bir hissəsini almaq müqabilində Bakını və onun neft rayonlarını özündə saxlamaq arzularına etiraz etməmişlər. Bu xəbər hamımızı sarsıtdı, qəzetlər onu hiddətlə çap edir. Tələt Paşa Berlinə getməyə hazırlaşır. Necə olursa-olsun Bakını almaq, almaq və almaq lazımdır" *(Bu barədə daha ətraflı bax. C.Həsənli "Azərbaycan Xalq Cümhuriyyətinin xarici siyasəti (1918-1920)" B., 2009, səh.152-155).*

Sentyabrın 12-də İstanbulda olan Azərbaycan nümayəndələri Almaniya səfirliyinə Azərbaycan hökumətinin etiraz notasını təqdim etdilər. Nota həmçinin bitərəf ölkələrin

də nümayəndələrinə verildi. M.Ə.Rəsulzadənin imzası ilə hökumət adından verilən bu notada Bakının tarixi, coğrafi, etnoqrafik və iqtisadi cəhətdən Azərbaycanın ayrılmaz tərkib hissəsi, paytaxtı olduğunu geniş şərh edilirdi. M.Ə.Rəsulzadənin təqdim etdiyimiz "Azərbaycan paytaxtı" sərlövhəli əsəri də məhz bu münasibətlə qələmə alınmışdır.

1918-ci il noyabrın 7-də M.Ə.Rəsulzadə İstanbuldan Bakıya qayıtdıqdan sonra müstəqil Azərbaycana qarşı təxribatların hələ də davam etdiyi bir şəraitdə İstanbulda yazmağa başladığı tədqiqatlarını "Azərbaycan" qəzetində dərc etdirməyə başlayır. Bu tədqiqatlar "Bakının tarixi" əsərinin müəllifi görkəmli tarixçi alim Sara xanım Aşurbəylinin qeyd etdiyi kimi bu sahədə "ilk təşəbbüs" idi.

1918-ci il noyabrın 8-də "Azərbaycan" qəzeti oxuculara xatırladırdı ki, İstanbulda olan M.Ə.Rəsulzadənin başçılıq etdiyi Azərbaycan nümayəndə heyəti Bakıya gəlmişdir. Bu xəbərdə onlarla birlikdə Əhməd bəy Ağayevin də Bakıya gəldiyi bildirilirdi. Maraqlıdır ki, noyabrın 10-da "Azərbaycan" qəzeti M.Ə.Rəsulzadə və Ə.Ağayevin vətənə qayıtması ilə əlaqədar "Vətənimizin iki simayi-möhtərəmi" sərlövhəli təqdimat səciyyəli iki maraqlı yazı vermişdi. Bunlardan "Ağaoğlu Əhməd bəy" sərlövhəli yazının müəllifi Ü.Hacıbəyli, "Rəsulzadə Məhəmməd Əmin" sərlövhəli ikinci yazının müəllifi isə Xəlil İbrahim idi. Bu vaxta qədər tədqiqatçılarımızın nəzərindən yayınmış bu yazıları da kitabda verməyi faydalı saydıq.

Məlumdur ki, Bakı Qafqaz İslam Ordusu tərəfindən azad edildikdən sonra da Bakını və Abşeronu Rusiyanın tərkib hissəsi hesab edənlər də vardı. 1918-ci il noyabrın 17-də ingilis hərbi hissələri ilə İranın Ənzəli şəhərindən Bakıya gələn ağqvardiyaçı general Biçeraxovun təyyarəsi şəhər üzərinə

xüsusi vərəqlər tökmüş və Bakını Rusiya şəhəri elan etmişdi. Rusların və erməni fəhlələrinin çoxluq təşkil etdikləri Bakı Fəhlə Konfransı Azərbaycan hökumətini tanımadığı barədə qətnamə qəbul etmişdi.

İran rəsmi dairələri isə müstəqil Azərbaycanı tanımamaq siyasətində israr edirdilər. M.Ə.Rəsulzadə onların da iddialarının əsassız olduğunu tarixi dəlillərlə sübut edirdi.

Aparılan çox böyük tarixi və elmi dəlillər öz nəticəsini də verirdi. Məsələn, Azərbaycan istiqlalının və Bakının Azərbaycan paytaxtı olmasının ən böyük düşmənləri sayılan ermənilər 1919-cu il yanvarın sonunda Azərbaycan hökumətinə rəsmi müraciət etmiş, hökumət və parlamentin fəaliyyətində iştirak etmək arzusunda olduqlarını bildirmişdilər. "Azərbaycan" qəzeti 1919-cu il yanvarın 31-də (102-ci nömrədə) belə bir xəbər dərc etmişdi: "Ermənilər Azərbaycan hökumət və parlamanında". Burada deyilirdi: "Bakı erməni milli komitəsi rəisi-vükəla həzrətlərinə bir məktub yazaraq ermənilərin Azərbaycan hökumət və parlamanına daxil olmaq istədiklərini bildirmişdir".

Kitaba M.Ə.Rəsulzadənin Cümhuriyyətin bir illiyi ilə əlaqədar nəşr olunmuş "İstiqlal" məcmuəsindən onun "Azərbaycan Cümhuriyyəti" əsərini də oxuculara təqdim edirik.

Bu əsərlər zənnimizcə Cümhuriyyət dövrü və bütövlükdə Azərbaycan tarixi ilə məşğul olanlar və bu məsələlərlə maraqlananlar üçün faydalı ola bilər. Onu da deyim ki, bu məqalələr M.Ə.Rəsulzadənin əsərlərinin 5-ci cildinə də daxil ediləcəkdir.

**Şirməmməd Hüseynov**

## Xan Sarayının təslimi

Xan sarayının "Asari-Ətiqə cəmiyyəti" tərəfindən təhvil alınması və bu münasibətlə şəhərdə böyük bir təntənəli nümayiş qurulduğu dünki nömrəmizdə təsvir edilərək nitqlərin təfsilatını bu günə buraxmışdıq. Şimdi "Asari-Ətiqə" cəmiyyətinin bir təşəbbüsü halından çıxaraq camaatin hərəkət və əhvali-ruhiyyəsinin təsirilə böyük bir milli bayram surəti almış bu nümayişdə irad edilmiş olan nitqlərdən bəzi mühümlərini müxtəsər dərc ediyoruz:

Məhəmməd Əmin Rəsulzadə əfəndinin nitqləri:

**1. Xan sarayı həyətində:** Millətdaşlar, inqilab sayəsində biz azad olduğumuz kibi bizim sabiqki hürriyyətimizə bir nişangah olan bu bina da azad oldu. Mütəxəssislər yüz illik əsarətindən sonra xilas olan bu binada sənətkaranə incəliklər buluyorlar. Fəqət bu gördügümüz şey mədəniyyəti-islamiyyə dəryasından alınmış kiçicik bir qətrədir. Bu bir güldür. İslam mədəniyyəti bustani-nəqqaşəsindən dərilmə soluq bir yapraqdır.

Camaat, islam mədəniyyəti nədir? O, islamla müşərrəf olan millətlərin yetişdirmiş olduğu dahilər, tərbiyə elədigi ərbabi-sənət və fənnin toplamış olduqları bir güldəstədir. Qərnətə, Qərtəbə, Bağdad, Buxara, Səmərqənd kibi baxçalardan dərilən güllərdən ibarət olan bu güldəstəyə ərəblər – İbn Rüşd, İbn Xəldun kibi, farslar Əbülfərəc Zəməxşəri kibi, türklər də Fərabi, İbn Sina, Uluğ bəylər kibi çiçəklər bağışlamışlardır. İslam mədəniyyətinin süqutu ilə islam hökumətlərinin süqutu arasında bir münasibət vardır.

Mədəniyyəti-islamiyyə ümumi degil idi. Elm, fənn, sənət və ədəbiyyat salonlara, böyük məhfillərə, xəlifə, soltan və əmirlərə yaxın dairələrə məxsus idi. Yalnız mədəniyyət degil, bununla mütənasib olaraq hakimiyyət də millətdə degil, sinfi-mümtazda, məhdud əllərdə idi. Bu bilxassə ərəb olmayan millətlərə təsir ediyordu. Türklər islam ülum və fününuna aləmcə məşhur böyük dahilər bəxş etmişkən, öz millətlərinə heç bir şey verə bilməmişlərdi. Çünki ərəbcə yazmış, farsca nəzm söyləmiş, ərəbləşmiş, farslaşmış və son zamanlarda isə ruslaşmışlardı. Millət ilə üləması arasında irtibat yox idi. Elm, fənn və ədəbiyyat milli degil idi. Bunun üçün hökumət də milli və ümumi degil idi. İştə, görüyorsunuz müəlləq istiqlalımızdan bizə ancaq bir Xan sarayı qalmış. Bu saray bizə göstəriyor ki, biz keçmişə malik bir millətiz. Fəqət hala ərəbcə və rusca söyləmək məcburiyyətində olan halımız bizə göstərməlidir ki, istiqbalı hənuz xətərlər içində bulunan bir millətiz. Əgər istiyorsan ki, muxtariyyətimiz əlimizə gəlsin, əgər istiyorsan ki, asari-ətiqəmiz daima özümüzdə qalsın, o zaman çalışmalıyız ki, hakimiyyət xanlara məxsus olmayıb ümummillətə keçsin, elm, fənn, bilik dəxi kahinlərin, mollaların mülki-məxsusi olmayıb ümumiləşsin. Bu isə yalnız türkləşmək və milliləşməklə olur. Yaşasın milli muxtariyyət, yaşasın türklük! (Alqışlar).

İştə, cəmaət, bən sizi və bugünki təntənənin sahibi olan "Asari-Ətiqə" cəmiyyətini təbrik edərək diyoram: bayramınız

mübarək olsun, çünki bu gün böyük ibtidaların ibtidasıdır! (Gurultulu alqışlar).

**2. Tazə Pir həyətində birinci dəfə:** Millətdaşlar! Siz bu gün şəhərimizdə böyük bir şənligə səbəb olan binanı gördünüz. Ondan daha böyük, daha ehtişamlı binalar şəhərimizdə çoxdur. "İsmailiyyə" binasının yanında o nədir ki!.. Əcəba, bizi oraya götürən nə idi? Şübhəsiz ki, o daşlar degil, o daşlardakı məna idi. Burada sizə bir həqiqət ərz etmək istiyorum. Vəqtilə şəhər idarəsi canişinə müraciət edib istəmişdi ki, Xan sarayını onun təhvilinə versinlər, tainki orada muzey düzəltsinlər, buna icazə verilmədi. Bu məsələ sərdar divanxanasında müzakirə edildigi zaman istibdadın ərkanlarından (məşhurdur) biri demişdi ki: "Xan sarayının qapısı açıla bilməz, çünki o açılarsa Bakı müsəlman şəhəridir, camaat gedər görər, keçmişi yadına düşər, oyanar, həyəcani-milliyyəsi təhrik olunar". Görüyorsunuz ki, istibdad həyati-milliyyədən nə qədər qorxuyordu. Bunu siz özünüz də çox kərə idi böyük bir təntənə ilə təslim olunan binanın yanından keçərkən görmüşsünüz ki, oradakı qaravullar adamı süngü ilə qorxudurdular. Fəqət inqilabçı demokratiya hökuməti hissiyyati-milliyyədən qorxmuyor. O yalnız asari-ətiqəni degil, millətin qəsb olunmuş hüququnu belə qaytarıyor. Demokratiya hökuməti açıq bir alın ilə elan ediyor ki, "hər hanki millət nə cür istiyorsa o cür öz işlərini aparsın, istiyorsa muxtar, istiyorsa müstəqil olsun, hətta istiyorsa ayrılsın!".

İştə, aradakı fərq (Alqışlar). Bunu biz bilməli, təqdir etməliyiz. Bilməliyiz ki, hürriyyət və inqilabçı demokratiyaya endirilən zərbə millətlərə endirilmiş bir zərbədir. Əgər istiyorsaq ki, Xan Sarayının əsirlikdən xilası bu millətin əbədilikcə əsirlikdən xilasına həqiqi bir ibtida təşkil eləsin, o zaman inqilabın, hürriyyətin müdafiəsinə hazır olalım, dostumuzla düşmənlərimizi tanıyalım. Yaşasın inqilab. Var olsun demokratiya! (Alqışlar).

**3. Tazə Pirdə ikinci dəfə:** Camaat! Təkrar sizin hüzurunuza çıxmaqdan məqsədim buradan getmədən əvvəl xatirimə gələn bir nöqtəni sizə ərz eləməkdir. İmdi siz Xan Sarayından gəliyorsunuz. Gördünüz oradakı o bizim tazə əsarətdən xilas olmuş binamızı. Gördünüz ki, saxsı qırıqlarına, süpürgə töküntülərinə, bilməm nə anbarlarına təxsis edilmiş yıxıq-tökük bir saraya varis olmuşuz. Siz əgər o möhnətdidə divarlara diqqətlə baxsaydınız şadlığınızdan bir az fariğ olub da Xan sarayındakı xizzəti görsəydiniz, heç şübhəsiz ki, "sənə nə oldu bu günə düşdün!" – deyə sorardınız. Və əmin olunuz ki, o daşlar dilə gələr, sizə deyərdilər ki: bənim əsirligimdə əsir edənlərdən ziyadə təqsir bəni əsir verənlərdədir. Kənardan gələn hücumlara qarşı içəridə hökm sürməkdə olan xanlar birləşməgi bilmədilər. Bakı öz başına, digərləri də öz başlarına hərəkət etdilər. Onlar ancaq öz nəfslərini gördülər, xəlqi düşünmədilər.

Əvət, biz o daşları, o bizə əsarətimizi təmsil edərək daş halına gələn o binanı dindirsəydik bundan başqa cavab alamazdıq.

Bu cavabdan alacağımız ibrət nədir? Bəlli: birləşməli, ittifaq etməli. Xilasımızı, müdafiəmizi başqalarından, ağalardan, varlılardan gözləməməli, bütün millət özünü qazanmaya, özünü saxlamaya hazır olmalıdır. Bilməlidir ki, yalnız ağaların, yalnız böyüklərin və yalnız varlılar himməti ilə xilas olan millət həqiqi surətdə xilas olamaz. Öz xilaskarlarına əsir olar, böylə bir hal isə təkrar daşları ağladar, dilə gətirər. Bu millət muxtar olmalı, fəqət bilməlidir ki, millətin işini ancaq millət özü görməlidir.

Bundan sonra tikdigi evləri xanlara degil, millətin özünə məxsus olaraq tikməlidir. Bunun üçün də lazımdır ki, millət ümumiyyət etibarilə fədakarlığa hazırlaşsın. Var olsun fədakar millət! (Gurultulu alqışlar).

*"Açıq söz", 25 dekabr 1917, №637*

## Bakı məsələsinə dair mülaqat

Bakı alınmamışdan əqdəm bizim bədxahlarımız tərəfindən Bakını Azərbaycandan ayırmaq üçün cürbəcür vəsilələr, dürlü-dürlü hiylələr aranıyordu.

Bu xüsusda Tiflis "məhafili" ən ciddi iqdamatda bulunur idi. Həmin "məhafildən" Bakı Azərbaycanı olmuyub, "sərbəst" şəhər (volni qorod) olsun şüarı dəxi çıxmış idi. Həmin şüara Tiflis saxta sosialist vərəqələri və erməni qəzetləri rövnəq verib Avropa siyasi məhafilinin diqqətlərini Bakı məsələsinə cəlb etmək iddiasında bulunuyorlardı.

Həmin məsələ xüsusunda İstanbulda nəşr edilən "Tərcümani-həqiqət" qəzetəsi mühərrirlərindən birini İstanbulda Azərbaycan heyəti-mürəxxəsəsi rəisi Məhəmməd Əmin Rəsulzadə əfəndilərinin nəzdinə göndərib, bəyanat istəmişdir.

Bakı alınmış isə də Məhəmməd Əmin cənablarının bəyanatının əhəmiyyəti itməmiş. Buna görə də onun bəyanatını burada dərc ediriz.

Məhəmməd Əmin bəy demişdir:

Bolşeviklərlə azərbaycanlılar arasında axıdılan qan yalnız Azərbaycan məqsədinin hüsulunu təmin etmək şərtilə dayandırıla bilər. Bunu biz səmim qəlb ilə arzu ediriz. Çünki əfəndim, Bakı Azərbaycanın, Azərbaycan da Bakınındır. Bakını Azərbaycandan ayırmaq istəyən kim olursa Azərbaycanın həyatına qəsd etmişdir. Bakısız Azərbaycan təsəvvür olunamaz. Bakı tarixən də, halən də bir türk şəhəri və müsəlman bələdəsidir. İstiqbalən də öylə olaraq Azərbaycanın paytaxtını təşkil edəcəkdir. Azərbaycan ismi belə ehtimal ki, Bakının petrol ocaqlarından ol dünyanın uzaq guşələrindən kəndisinə zairlər cəlb edən daim yanar təbii ataşlərindən alınmışdır. Azərbaycan bugünkü milli və mənəvi işığını dəxi Bakıdan alıyor. Burası Qafqaziya islamlarının mərkəzi-ürfanıdır. Azərbaycanın qabiliyyəti-həyatiyyəsini təmin edən vardati-mühümmə buradan hasil oluyor. Burası məmləkətimizin yeganə limanıdır. Bakı Azərbaycanın qapısıdır. Bütün aləmin iştəhasını cəlb edən petrolu olmadığı zamanlar belə Bakı Şimali Azərbaycandan ötrü əhəmiyyəti-ticariyyəyə malik mühüm bir nöqtə təşkil edirdi. İndi dəxi o əhəmiyyəti haizdir. Bunların həpsinə bərabər Bakı, əksəriyyət nüfuz etibarı ilə müsəlmandır. Bakıda mövcud bulunan ərazinin, əmlakın, əfar və müstəqfatın qismi-küllisi müsəlmandadır.

Ətrafında bulunan köylər tamamilə müsəlman köyləridir, azəri türkləridir. Xülasə, Türkiyə üçün İstanbul, Almaniya üçün Berlin, Rusiya üçün Moskva nə isə Azərbaycan üçün də Bakı ondan artıq olmasa da, odur. Bu o qədər aydın bir məsələdir ki, bunu məsələ olaraq ortaya qoymaq həqiqətən də mövcübi-heyrətdir. Bakı bolşeviklərinin – rus imperialistlərinin Qafqaziyadakı yardaqçılarının bu fikirdə olduqlarını, azərbaycanlıların haqlarını inkar üçün bu şəkli ilti-

zam etdiklərini bilirdik. Əksəriyyəti kimlərdən ibarət olduğu məlum bulunan Bakı bolşeviklərinin ingilislər tərəfindən dəxi müzahirat görərək bu yolda təhrikatda bulunduqlarını duymuşuq. Fəqət Almaniya dövləti-fəximəsinin bu fikrə zahir və məhmi olacağını qətiyyən kəsdirəməzdik. Tiflis qəzetəsindən nəql etmiş olduğunuz xəbərdə mütləqa bir yanlışlıq olacaqdır. Şübhəsiz ki, Bakı petrollarının aləmşümul bir əhəmiyyəti vardır. Əlbəttə ki, bu petrol məsələsi rusları da, Qafqaziyadakı məktəbləri də, Türkiyə ilə müttəfiqlərin də əlaqədar ediyor.

Madam ki, Bakı ilə əlaqə petrola bağlı bir əlaqədir, deməki, iqtisadi və ticari məsələ qarşısında bulunuyoruz. Bəhri-Xəzər kənarında bulunan Azərbaycan petrolu su yerində işlədəcək deyildir. Petrol Azərbaycanın ən böyük ixracatını təşkil edir. Şübhəsizdir ki, Azərbaycan əcnəbi sərmayəsindən istifadə edəcək və bu sərmayənin Bakı ərazisində tətbiqin dəxi hər dürlü vasitələrlə təshil və təminə çalışacaqdır. Petrolun əhəmiyyəti-beynəlmiləliyəsindən istifadə üçün Azərbaycan hökuməti ilə anlaşmaq və bağlaşmaq mümkün ikən qafanı bədəndən ayıracaq qədər qanlı tədabirə əcəba, nədən ehtiyac görülsün? İştə bunun üçün bu etiqaddayam ki, Tiflis qəzetələri ilə nəşr olunan şayiə qərini-həqiqət olmasa gərək. Çünki düşünüyoram: sərbəst bir şəhər elan etmək surət ilə təmini təsəvvür olunan fəvaidi-müştərəkə Azərbaycan hakimiyyəti təxtində dəxi təmin edildikdən sonra Almaniya diplomasisi əcəba, nə üçün Azərbaycan həyati-milliyyə və mənafeyi-həyatlarına səbəbsiz bir surətdə qəsd etsin?!

*"Azərbaycan",*
*3 təşrini-əvvəl (oktyabr) 1918, №5*

## Bakı həqqində Azərbaycan hökumətinin notası

İstanbul qəzetələrində sentyabr ayı ortalarında Azərbaycan sülh heyətinin sədri Məhəmməd Əmin Rəsulzadə tərəfindən təqdim edilmiş və eyni zamanda surəti bitərəf və mərkəzi hökumətlər səfarətlərinə göndərilmiş bir nota dərc edilmişdir. Almaniya ilə Rusiya arasında əqd edilən əlavə müahidənamədə Bakının şura hökuməti əlində saxlanması həqqindəki maddəyə görə məzkur notada Azərbaycan hökumətinin Bakı şəhərinə tarixi bir həqqi olduğunu isbat etmək üçün şəhərin tarixi həqqində müfəssəl məlumat verilmişdir. Bu tarixi hüquq coğrafi, iqtisadi və milli təsəvvürat ilə isbat edilməkdədir. Həmçinin notada göstərilir ki, Bakı şəhəri elm, mədəniyyət və sənaye cəhətincə də Azərbaycan ilə əlaqədardır. Çünki ümumsiyasi, iqtisadi, ictimai, dini və xeyri müsəlman müəssisələri Bakıdadırlar.

Məzkur notada Almaniya ilə Rusiya arasında aqd edilən əlavə müahidənamə və millətlərin istiqlaliyyəti əsasına istinad edilməsi haqqında təəccüb izhar edilir. Rusiya inqilabı tərəfindən elan edilib və Brest-Litovsk əhdnaməsində təsdiq olunmuş əsasa istinadən ki bu əsas üzərinə hər millət öz müqəddəratını həll etmək ixtiyarına malik olur, Azərbaycan milləti mərkəzi dövlətlərin hüsni-münasibatına etimad edərək əsrlərdən bəri təzyiqi altında qaldığı Rusiya istibdadını yıxıb özünü müstəqil elan etdi. Azərbaycan milləti Almaniya hökumətini əlavə müahidənamə ilə Azərbaycanın ruhani, iqtisadi və siyasi mərkəzi, paytaxtı olan Bakı şəhərinin Rusiya əlində qalmasına rizasından xeyli narahat olmuş idi. Notanın axırında ümidvarlıq bəyan edilir ki, Almaniya dövləti Azərbaycan hökuməti və millətinin Bakı şəhərinə malik olmaları hüququnu ciddi surətdə nəzərə alar.

*"Azərbaycan",*
*5 təşrini-sani (noyabr) 1918, №31*

## Bakı xəbərləri

Azərbaycan Cümhuriyyətinin İstanbul konfransı müraxxəsləri Məhəmməd Əmin Rəsulzadə, Aslan bəy Səfikürdski, Əhməd bəy Pepinov və Şüyxülislamov cənabları dün təşrini-saninin 7-də Bakıya varid olmuşlardır.

Məşhur mühərrir və cəmaət xadimi Əhməd bəy cənabları dəxi Bakıya gəlmişlərdir.

*"Azərbaycan",*
*8 təşrini-sani (noyabr) 1918, №34*

## Vətənimizin iki simayi-möhtərəmi
## Ağaoğlu Əhməd bəy

Əhməd bəy Ağayevi kim tanımıyor? Hələ Parisdə tələbə ikən məşhur Fransa alimi Renanın "Dini-islam müneyi-tərəqqidir" meylindəki idareyi-əfkaranə qarşı yazmış olduğu cavabi-şifahisi ilə Fransada şöhrət tapmış olan Əhməd bəy öz vətəni olan Azərbaycanda fəqət erməni-müsəlman qitalı olan 1905-ci ildə məşhur oldu.

Erməni yazıçılarının müsəlmanlar əleyhindəki böhtan və iftiralarına cavab verən və qələm hücumlarına köks gərib səbat göstərən Əhməd bəy öylə bir müasir lisana malik idi ki, onun yazdıqlarını oxuyanlar müsəlmanlar əleyhində deyilən sözlərin məhz yalan və iftira olduğuna kəmal ilə inanıb etibar və etiqad ediyordular. Əhməd bəyin bu yazılarının əsəri idi ki, Azərbaycan türkləri həqqində erməni iftirasından dolayı əmələ gələn qara fikirlərin soyuq və kəsif buludları dağılıb həqiqət günəşi meydana çıxmaqla hər kəsin qəlbini

müsəlmanlar lehinə qızırdı və nifrət əvəzinə rəğbət və hüsnitəvəccöh əmələ gəlirdi. "Həyat"ı ilə Azərbaycan türklərini diriltmək və "İrçad"ı ilə onlara rahi-nicatı nişan vermək yolunda öz həyatından əl çəkəcək dərəcədə çalışan Əhməd bəy degil bir müasir yazıları ilə, bəlkə bütün amal, ifal və əfkar ilə milləti həqqində çalışdığını Petroqrad və Moskva məhafiliaaliyeyi-siyasiyyəsində Azərbaycan türkləri tərəfindən göndərilmiş mürəxxəs sifətilə gördügü saf işlər və ümumqafqaz ictimaində canişin hüzurunda söylədigi bəliğ nitqləri ilə isbat etdi. O işlər sayəsində idi ki, Bakı müsəlmanlarının neft və mədən evləri öz əllərində qaldı – və illa əldən gedəcək qorxusu var idi – və o nitqlər sayəsində idi ki, ümumqafqaz müsəlmanları baxüsus Azərbaycan türkləri Qafqaz hökumətinin məzhəri-etina və etibarı oldu.

Millətini xarici təərrüzat və təcavüzdən vəqayə və müdafiəyə çalışan Əhməd bəy daxili mərəzlərimiz ilə də daim mübarizədə idi. Tənəzzülümüzə qarşı "Tərəqqi"si ilə müdafiə edərək yorunuq və istirahət nə olduğunu il uzunu bilməzdi. O idi ki, bir tərəfdən bir bu qədər sərf edilən baş və bədən qüvvəsi, digər tərəfdən nicat və rifah halları xüsusunda can çürütdüyü həmcinslərindən bir parasının kəndisinə qarşı rəva görülən narəva rəftarları, üçüncü tərəfdən mübarizeyihəyatiyyə məsələsi Əhməd bəyi o dərəcədə əsəbi bir hala salmışdı ki, uzun və sükun bir istirahətə əşədd surətdə məcbur və möhtac qalmışdı.

Əhməd bəy istirahət qəsdilə vətənindən müfariqət etdi, lakin bu istirahəti seyfiyyələrin və kurortların salim və sakin guşələrində aramadı. Zatən öylə yerlərdə istirahət edə bilməzdi. Əhməd bəydə öylə bir təbiət var ki, öz həmcinslərindən uzaq biləlümum müsəlmana biganə olan yerlərdə istirahət degil, yaşamaq da gücdür. Onun üçün millət həyatı görünən,

millət qoxusu gələn bir yer lazım idi ki, həm "şüğl və məkanın dəgişməgi dəxi istirahətdir" qaidəsinə riayət və həm də Bakı kibi Azərbaycan müsəlman mərkəzini əvəz edə bilə idi.

Bu yer böyük türklərin böyük paytaxtı olan İstanbuldan başqa nə ola bilərdi ki, orası islamlıq və türklük həyatının hər bir cəhətcə xoş edən, qaynaşan böyük bir mənbəyidir.

Əhməd bəy İstanbula getdi, daha doğrusu köçdü və artıq "oralı" oldu. Zənnində idi ki, yeddi-səkkiz il müfariqətindən və zənn ediyorum istirahətindən sonra təkrar vətəninə qayıtdı. Lakin Əhməd bəyin İstanbuldakı istirahəti yenə çalışmaqdan ibarət idi. Fərqi bu idi ki, artıq kəndisini anlayan, səy və cuşesini təqdir edən bir mühit içində çalışırdı və çalışmağı da yenə vətən və millət yolunda idi. Bizi İstanbul və Avropaya bildirirdi, bizim də dünyada var olduğumuzdan lazım olan yerlərə xəbər verirdi...

Əhməd bəy yaxşı bir vəqtdə vətənə qayıtdı. Belə vəqtdə ki, türk qəhrəmanlarının müqtədir əlləri ilə zənciri-əsarətdən azad edilmiş zəif və düşkün vətən bu gün dərd bilən və çalışqan övladlarının hər tərəfdən köməginə möhtacdır.

Ümidvar olmalıyıq ki, Əhməd bəy və ümum vətənpərəstlərimiz bu kibi günlərdə ittifaq və ittihad ilə əl-ələ verib qoymazlar ki, sərbəst vətənimiz təkrar özgələrin bəndi-əsarətinə giriftar olsun.

Ü.

*"Azərbaycan",*
*10 təşrini-sani (noyabr) 1918, №35*

## Rəsulzadə Məhəmməd Əmin

Sevgili mühərririmiz, istəkli natiqimiz, millət yolunda həyatını nisar edən, cəmaət xadimimiz Rəsulzadə Məhəmməd Əmin cənabları 3 gündür şəhərimizə varid olmuşdur.

Azərbaycan imarətinin binasını qoyan, bu uğurda kəraətlə həyatını təhlükəyə atmış olan Məhəmməd Əmin əfəndi biz Azərbaycan türkləri üçün işıqlı bir ulduz rolu oynayaraq istiqlali-milli yolunu Nikolay və Protopoviç dövrünün müzəlləm gecələrində belə milliyyət müsafirlərinə göstərməsi, rəhbərlik etməsilə vətənimizə böyük bir xidmət göstərmişdir. Hələ novcavan ikən 1905 inqilabından sonra meydani-siyasət və ictimaiyyəyə atılaraq o vəqt yenicə təsisə başlayan milli-siyasi təşkilatımızda mühüm mövqelər tutduqdan sonra irtica dövrünün hüluli ilə rus qaragüruhunun qəzəbinə giriftar olub İrana qaçmış və orada dəxi müsəlmanların mənafeyini candan əziz tutaraq İran inqilabçıları əl-ələ verərək bir tərəfdən

"İrani-nov" qəzetəsi nəşri ilə millətin fikrini işıqlandırmaqla bərabər digər tərəfdən də fədailər zümrəsində Məhəmmədəli şahın yaxıcı-yıxıcı, keyfə-mayəşası müqabilinə mübarizə etmişdir. Bədə orada dəxi irtica baş qaldıraraq rus istibdadı ilə İran keyfə-mayəşası əl-ələ verdikdə həyati təhlükəyə düşərək İrandan da İstanbula hicrət etmişdir. İstanbulda bir mühərrir sifətilə Məhəmməd Əmin əfəndi müxtəlif qəzetə və məcmuələrdə iştirak edərək Azərbaycan-Qafqasiya türk islamlarını Osmanlı türklərinə tanıtdırmaqda mühüm bir rol oynamışdır. Bugünki meyvənin o vəqt toxumunu saçanlardan birisi də haman Məhəmməd Əmin əfəndi olmuşdur.

Nəhayət, cahan müharibəsi ibtidasında Bakıya qayıdaraq ixtiyarı əlindən alınmış olduğu halda məhəlli qəzetələr başında duraraq "türkləşmək, islamlaşmaq və müasirləşmək" şüarı ilə "Açıq söz" bayrağını qaldıraraq milləti bugünki işıq tərəfinə dəvətə başlamışdır. Axirüləmr Rusiya inqilabı başlanması ilə artıq meydanı açıq görərək Azərbaycan muxtariyyəti şüarını meydana ataraq məzkur şüarla işləyən Gəncə firqəsi ilə birləşib son il yarım vəqtini ancaq bu fikrə təxsis etmişdir. Bu uğurda Məhəmməd Əmin həzrətləri vəfat edən övladına təziyə saxlamaya macal tapmaz bir dərəcədə fədakarlıqla çalışmış və nəhayət məqsədinə nail olaraq Azərbaycan Cümhuriyyəti elan edilmişdir. Bundan sonra Məhəmməd Əmin öhdəsinə daha mühüm vəzifələr düşərək İstanbul konfransında Azərbaycan heyəti-mürəxxəsəsi rəisi sifətilə aləmi-islam paytaxtına gedərək orada Azərbaycan uğrunda çox təşəbbüslər etmiş, Azərbaycana edilən təcavüz və həqsizliklərdən vətəni müdafiəyə çalışmışdır. Bakının Rusiyayamı, ya Azərbaycanamı məxsus olması məsələsində Məhəmməd Əmin əfəndi tarixi, mədəni, iqtisadi dəlillər ilə Bakının Azərbaycanın başı və gözü olduğunu isbata qalxmış-

dı və həqqimizdə bunca həqsizlik işləmiş olan dövlətlərə protesto verdi.

20 yaşından bu günədək 13 il müddətində türklük, islamlıq, hürriyyət və istiqlaliyyət uğrunda Məhəmməd Əmin əfəndi fövqəladə fədakarlıq ibraz etmişdir.

Azərbaycanlılar Məhəmməd Əminlər yetişdirməsinə iftixarla öylələri həqqində qədrşünaslıqlarını da ibraz etməlidirlər.

X.

*"Azərbaycan",*
*10 təşrini-sani (noyabr) 1918, №35*

## Azərbaycan paytaxtı

"Quzğun dəniz"in[1] sahilində, əski Albaniyanın[2] mərkəzində, Şirvanşahların paytaxtında, Abşeron yarımadasının cənubunda 49-51 dərəcə tul, 40-21 dərəcə ərzində bir tərəfdən Bayıl, digər tərəfdən Zığ adilə suların bağrına qol uzatmış, qarşıdakı adaların himayəsilə pənahsız gəmiləri hər növ tufanlara qarşı qoruyan mərhəmətkar bir qucaq açmış liman var:

Bakı bəndəri!

---

[1] Əski türklər üç türk gölündən – Baykal, Aral və Kaspi – böyügü olan Kaspiyə "Quzğun dəniz" derlərdi. Bunun türklərcə digər bir adı da "Türk dənizi" idi.

[2] Şirvan vilayətinin, hazırki Bakı quberniyasının yerində qüruni-əvvəlidə "Albaniya" adilə məruf bir qövm yaşıyordu. Bu qövm olduqca cəngavər olub Roma imperiyası ordularına müqavimət eləmişdi. Sonra şimaldan axın edib gələn türk seylaninə dayanamayıb Xəzər türkləri tərəfindən münqəriz olub məmləkətləri tutulmuş və türk qəbilələri tərəfindən oturaq edilmişdir.

Şöhrətli Azərgədəsi, "odunsuz yanar, sudan qorxmaz" münqəbədar atəşi[1] uzun zamanlardan bəri məruf, tarix səhifələrini boyamış neft quyuları, hərdənbir fövran edər "yanardağ"ı ilə Azərbaycan isminin müsəmması həmişəyanar bir ocaq var:

Bakı bələdəsi!

Bakı – Azərbaycanın paytaxtı.

Bakı, bu gün istiqlalını elan etmiş olan Şimali Azərbaycanın mərkəz idarəsi olduqdan sonra degil, daha əvvəldən, qədim zamanlardan bəri Azərbaycan paytaxtı-paytaxtı degilsə də, mühüm mərkəzlərindən biri olmaq heysiyyətinə malik olmuşdur.

Azərbaycan kəlməsinin "Od" mənasındakı "Azər"dən ayrıldığını iddia edənlər, buradaki atəşgədələri göstərir, ona görə də bu yerlərə "Od abad edən" mənasında "Azərbaykan" və yaxud "Azər abad kan", daha sonra müərrib olaraq "Azərbaycan" denildiyini bəyan edərlər.

Şəmsəddin Sami bəy mərhum "Qamusi-əl-əlam"ında "Azərbaycan" kəlməsinin əvvəlcə Təbrizin özünə, sonra ətrafına, daha sonra vilayətinə ələm olduğunu qeyd ediyorsa da, bir az aşağıda Azərbaycanın toprağını və yerlərinin mürəkkəb olduğu məvaddi-tərif edərkən diyor ki: "Məmləkətin toprağı ərazi-bir kaniyyədən olub, qaz çıxarır yerləri və neft quyuları çox olduğu kibi, zəlzələləri dəxi pək sıx olub, qəsəbələri və ələlxüsus mərkəzi olan Təbriz şəhəri dəfəatla xərab olmuşdur. Zəmani-cahiliyyətdə atəşgədələrinin kəsrəti və bəlkə "Azərbaykan" təsmiyyə olunması dəxi bir atəşi-daimi halında olan bürkan və neftlərinin kəsrətindən iləri gəlmişdir".

[1] Əski iranilərdə bir üç atəş əfsanəsi vardır. Bu əfsanə Azərbaycan ənənatı ilə əlaqədardır. Bu əfsanədəki həmişə yanar üç atəş "odunsuz yanar, sudan qorxmazmış" ki, Bakının yerdən çıxar və suda yanar təbii qazına kinayə edilmişdir.

Görüyorsunuz ki, müəllifi-möhtərəm sizə tamamilə aşina bir mənzərə təsvir ediyor. Tərif tamamilə Bakıya və vilayətinə aid daimi bir atəş halında bulunan bir kan – Bakı, dəfəatla zəlzələyə məruz qalan da Şamaxıdır. Burada Təbriz və həvalisinə bənzəyən bir şey yox. Çünki o həvalidə nə qaz çıxarırlar, nə də neft quyuları vardır.

Bunu zikr etməkdən məqsədimiz təbii, Təbrizin Azərbaycan mərkəzi olduğunu inkar degil, əsl Azərbaykan isminin müsəmması olacaq nöqtənin Bakı ola biləcəgini göstərməkdir.

Əvət, Bakı yalnız bugünki Azərbaycan Cümhuriyyətinin paytaxtı degil, əski Azərbaycan qitəsinin də mühüm bir mərkəzidir. Vəqtilə bu mərkəz əski "Midiya" yerini tutan Azərbaycan sakinlərini müqəddəs atəşləri ilə qızdırmış; bu hərarətlə o, İrandan, Hindistandan və dünyanın sair yerlərindən zairlər cəlb eləmişdir.

Bakı bu gün də ziyarətgah, bu gün də məbəddir.

Bugünki Bakı zairləri əski atəşpərəstlər kibi din hissiyyatı və ruh ehtiyaclarını tətmin üçün degil, maddi həvəslərini təmin, artıq təmələrini doyurmaq üçün gəliyorlar. Buradakı sərvəti kəndi kəşanələrinə axıtmaq istiyorlar. Bu müasir zairlər tarixin hekayələrini oxurkən hind zairlərinin gəlib burada müqəddəs atəşlərə tapınmaqdan başqa bir faidə gözləmədiklərini heyrətlərlə tələqqi edər, o nur və hərarət sərgərdanlarını qətiyyən anlıyamazlar. Çünki onlar "eşqi" şəmin başına firlanıb da kəndisini yakan və yakılarkən səs çıxarmayan "pərvanə"dən[1] degil, çəmənlikləri, çiçəklikləri birər-birər gəzib də güllərdən şirə çəkən "arı"lardan ögrənmişlərdir.

---

[1] "Ey morğe səhər eşq ze pərvanə beyamuz
Kan suxtera can şod-o avaz nəyaməd"

Sədi

Onlar icab edərsə palçığa girər, hisə bulaşar, mazuta batar, fəqət atəşi tapmazlar.[1] Çünki məbud olaraq onlar qazı, nefti degil, bunlardan hasil olan "Sarı mədəni" tanırlar.

Fəqət Bakının müridləri yalnız bu uzaq vilayətlərin zəvvarı degildir. Buranın maddi deyil, mənəvi atəşlərinə Hindistan məcusi və İran zərdüştlisindən daha şiddətli bir ehtiyac və daha qüvvətli bir imanla mərbut olan mücavirlər, mötəkiflər[2] vardır:

– Azərbaycanlılar!

Əvət, Bakı əski məcusilərdən ötrü şöləsinə yakılır şəm; qomşu imperialistlərlə Avropa kapitalistlərindən ötrü şirəsi çəkilir gül isə, Azərbaycan türklərindən ötrü təvaf olunur əməl kəbəsi, etikaf olunur həyat məscididir.

Bu, bizə bir əməl kəbəsi və həyat məscidi olan Bakımızı, əcəba, heç bilirmiyiz?!...

Bu suala cavab almaq üçün mətbuatı-ümumiyyəmizin cavan hücrəsini ümumi bir surətdə gözdən keçirdim. Bakıya aid bir şey görmədim. Bu bana həvəs və cəsarət verdi. Müxtəsər də olsa, Bakının tarixi həqqində bir kaç yapraq qaralıyalım, dedim. Şübhəsiz ki, bu sətirlərlə veriləcək məlumat Azərbaycan Cümhuriyyəti paytaxtının şan və heysiyyətı ilə mütənasib olamıyacaq. Çünki əl altında nə o qədər mənbə, nə də o qədər zaman və fürsət vardır. Fəqət Azərbaycan mətbuatında bü xususda daha heç bir yazı yazılmadığından, düşündüm ki, naqis də olsa, bir şey olsun. Biz naqisini başlarız, mütəşəbbüs gənclərimiz də çalışar, vətən eşqi, məmləkət məhəbbəti ilə səy eylər, bu başlanğıcı təkmil edərlər; o zaman biz də əziz paytaxtımızın mükəmməl bir tarixinə malik olmaq səadətini dərk edəriz.

---

[1] Tapmaq, tapınmaq – türkcədə ibadət və təəbbüd etmək mənasındadır.

[2] Mötəkif – günlərlə məsciddə oturub da bu yenə ibadətə (etikafa) oturan zatə denilir.

## II

"Bakı" kəlməsi imdiki halda dünyaca məruf kəlmələrdən birisi və hər kəsin virdi-zəbanı olduğu kibi, hər azərbaycanlının da "bismilə"sidir.

Bu kəlmə, bilxassə Azərbaycan istiqlalının xofla ümid arasında bir böhran keçirməkdə olan bu günlərdə həssas ürəklərə müəssir bir iztirab verməkdədir.

Qəlblərimizi bu qədər əlaqədar edən "Bakı" kəlməsi, əcəba, hankı mənayı ifadə ediyor?

Bu kəlmənin "bad" və "kub"dan mürəkkəb olan "badi kubə" kəlmeyi-farsisindən müxəffəf olaraq ayrıldığı və "yeldögən" mənasına gəldigi mərufdur; böylə bir "təsmiyyə"-nin səbəbi isə burada hakim olan Şimaldan əsən "Xəzri" və Cənubdan əsən "Gilavar" yelləri imiş.

Fəqət Bakı isminin böylə mənayə malik olduğu məşhur isə də, dərin düşünür müdəqqiqlər böylə bir vəchi-təsmiyyeyi amiyanə görüyorlar.

İran müabiləri Bakı isminin əslini iranilərin tələffüzləri "badi kubə"dən aradıqları kibi, bəzi türkçilər bakılıların "bəki" şəklində tələffüz elədikləri bu kəlməyi "bak" kəlməsindən ayırmaq istiyorlar. Ərəb müvərrixlərindən bəzilərinin paytaxtımızı "baq" şəklində qeyd etdiklərindən dəxi istidlal edərək, bir rəvayətə görə, Xəzər türkləri tərəfindən təsis olunmuş olan bu şəhərin əslində "bək" müqabili bulunan "bak" kəlməsindən iləri gəldigini söyliyorlar. Əksər ərəb müvərrixlərincə "Bakuyə" məruf olan tələffüzü də (bəkcigəz)in müərribi imiş – deyə iddia ediyorlar.

Ərəb coğrafiyunundan Yaqut Həməvi Bakıyı "Bakuyə" şəklində qeyd eləmişdir.

İbn Əl-Əsir Xəzəri isə "Kamil" adlı tarixində Bakı şəhərini "baq" olmaq üzrə göstəriyor və diyor ki, "Baq-Bəsfərcan

elində bir şəhərdir". Yaqutun Bəsfərcan tərifinə görə Əran (yəni Şimali Azərbaycan) ölkəsində kain bir elin adıdır.

Amasiyalı Hüsaməddin "İqdam"da nəşr elədigi bir məqaləsində İbn Əl-Əsirin "baq"ını alaraq bunun "bak"dan çıxdığını "bak"ın da Bakuyə şəklinə gəldigini və bunun da şimdiki türkcəmizdə "Bəkşəhri" demək olduğunu iddia etməkdədir. Digər bir mühərrir dəxi Bakının yənə türkcə olaraq Sultanülqəra və Şahkənd mənasına olaraq "Bək köy" olduğunu zikr edərək şair Şeybaninin aşağıdakı:

*"Bək köy də bana göründü bənli*
*Ol lalə üzar simi-tənli"*

beytini dəxi istidlal üçün iqtibas ediyor.

"Baku" kəlməsinin istiqaqi haqqında bu kibi tədqiqat biçimli digər mülahizələr dəxi yox degildir. Fəqət bu mütaliələrin qərini-həqiqət olduğunu təsdiq etmək məsuliyyətini boynumuza alamayız.

Bizə öylə gəliyor ki, Bakının qədimligini, burada əski iranilərin, yunanilərin, xəzərlərin və sair qədim millətlərin hökmran olduqlarını nəzərə alaraq Bakı kəlməsini farscaya və yaxud türkcəyə uydurub da kəndisinə mətlub bir mənayi bağlamaqla məsələ həll ediləməz.

Bakı kəndisində bulunan gərək Venedik kari qüllələri və gərək hindkari azərgədələri ilə bəşəriyyətin əski dindarları olan hind atəşpərəstlərinə bittəb bəlli idi. Bunu göstərər sərih məlumati-tarixiyyə vardır.

Bir bürkan halında daimi atəş surətində yanıb tutuşan Bakı atəşpərəstlərə yabançı qalamazdı. Həm qalmamışdır, burası onlarca bir ərzi-müqəddəs idi. Suraxanıdakı atəş-

gədə Azərbaycan atəşgədələrinin ən qüdsisi idi. Buraya hind məczublərinin zəvvar qafilələri təşkil edərək gəldikləri müsəlləmdir.

Bu mülahizəyə görə, "Baku" kəlməsinin iştiqaqını nə bugünki farscada, nə də türkcədə aramaq səhih olamaz. Bunun üçün "sanskrit" dilinə müraciət edilərsə, daha münasib olur.

Sanskritcədə "Baku" kəlməsi bir məna ifadə ediyormu? – biləmiyoruz. Fəqət bəzi mənbələrə görə hind lisanlarından (keçrati-qədim) dilində "Baku" kəlməsi "həqiqətə doğru" mənasını ifadə ediyormuş. Çox ehtimal verilə bilər ki, hind məcusiləri möcüznüma atəşgədəsindən dolayı burasına böylə müqəddəs bir ism vermiş olalar. Bilxassə ki, "odunsuz yanar və sudan qorxmaz" üç atəş əfsanəsi dəxi Baku atəşgədəsinin bulunduğu yerə isnad olunuyor. Tarixən müəyyən olmayan bir zamanda – İran tarixilə məşğul olanlar diyorlar ki, – atəşpərəst zərdüştilərindən bir qafilə Azərbaycandan "Abşeron" yarımadasına gələrək sahildən iki fərsəx fasilədə Baku atəşgədəsini vücudə gətirmişlərdir[1]. Onların anlatmasına görə, "bu məbəd (yəni Baku atəşgədəsi) sıcaq bir topraq üzərində təsis olunmuşdu. Bütün o tərəflərdə kəsrətlə mövcud olan "şist" yağlarilə neftin qarışmasından hasil olmuş (karbonlu hidrogen) o sahədə kəsrətlə vardı. Bu qaz atəş alıyor, yanıyordu. Hətta yalnız topraq üzərində degil, bu qaz dəniz açıqlarında da mövcuddur. Alovlu bir şey atınca haman suyun üzü atəş alıb yanıyor."

Bakının Hindistan, İrani-qədim və atəşpərəstliklə olan əlaqəsi adının nərədən gəldigi həqqində verilən izahat arasında göstərildi.

---

[1] "Aqşam" qəzetəsində Köprülüzadə Məhəmməd Fuad bu fəqərə həqqində əlavə ediyor ki: "Müvərrixən icra edilən tədqiqat nəticəsində elm aləmində bir həqiqət şəklində tələqqi edilən bu rəvayətin heç əsli olmadığı və atəşpərəstlik bu sahəyə ancaq 18 əsrdə hindlilər və hindli parsilər tərəfindən idxal edildigi təhqiq etmişdir".

Burasının Yunani-qədim və Venedik dövrləri ilə münasibətdar olduğunu bildirir. Asar da vardır. Bayıl qabağında sular içərisində bulunan əski qələ hasarını andıran barıların ənqazı bu asardandır. Şəhərimizin gözəlliklərindən birini təşkil edən Kupalniya (dəniz hamamı) yapıldığı zaman bu ənqaz səmtində "məzkur hamam müqabilindən sahildə duran "Qız qələsi"nə doğru uzanan bir növ səngfərşlər kəşf olunduğu zaman mütəxəssis mühəndislər bunun əski Yunan asari-memariyyəsindən olduğuna zahib olmuşlardı. Məzkur Qız Qələsi dəxi adilə türk əsəri isə də, tərzi memarı və şəkil etibarilə Venedik asarını andırıyormuş.

Haşımov meydanında qoşa qələ qapısı üzərində müşahidə olunan rəsmlər dəxi islamiyyətdən əvvəlki bir dövri-qədimə aid olsa gərək". İsminin nə kibi bir məna ifadə elədigi həqqində mövcud olan bu qədər rəvayətlər içərisində amiyanə bir təfsiri olan "bad" və "kub" təvəccöhi məruf olduğu kibi şəhərin qədimligi və kim tərəfindən təsis olunduğu babda da iranilərcə məruf bir rəvayət vardır. Bu rəvayətə görə, Bakı Nuşirəvanı-Adil tərəfindən təsis olunmuşdur. Buna müqabil şəhərin Nuşirəvan istilasından daha əvvəl Xəzər xaqanlığına tabe bir Türkmən xanlığı dairəsində olduğu da iddia olunmaqdadır. İbn Əl-Əsirin Bakının "Bəsfərcan" elində bir şəhər olduğunu zikr etdigini qeyd etdik. "Məcməülbəldan" sahibi Yaqut Həməvi isə Bəsfərcan elini: "Bəsfurcan", Bəsluxan, Basluxan kibi Basfurkanın müərribidir. Türklərin "bay siburqan" dediklərinə iranilər "Basfurkan", ərəblər də "Bəsfurcan" və "Bəsfərcan" demişlərdir. Şərqdə Seyhun üzərində kain Siburqan şəhri, Xorasanın mərkəzi-qədimi olan Mərv önündə axan Macan (Makan) nəhri üzərində vaqe Əşfurqan (Siburqan) şəhəri və Qərbdə Kür nəhrinin Şərq tərəflərini mühit olan

"Basburqan" eli türk bilad və asari-məşhurəsindəndir" deyə izah ediyor[1].

Şəhərin kimlər tərəfindən təsis edildigi ixtilaflı olduğu kibi, hankı sənədə təsis edildigi də ixtilaflıdır. Burasının məmurə olaraq 1500 sənədən bəri məlum olduğu, hətta bir rəvayətə görə Miladi-İsadan 978 sənə əvvəl dəxi burada məmurə olduğu rus qamuslarında müqəyyiddir.

## III

Bakuyi ilk dəfə bir liman (bəndər) olaraq ərəb müvərrixlərindən "Əlmüqəddəs" zikr eləmişdir.

O zamanlar Dərbənd (ki ərəblər ona Babül-Əbvab, türklər Dəmir Qapı diyorlardı) daha ziyadə əhəmiyyət və şöhrətə malik idi. Bakı isə Dərbənd mülhəqatından bir bəndər sayılırdı. Buna görə də məşhur ərəb müvərrixləri kitablarında bu tərəflərdən bəhs edərkən Dərbəndə böyük əhəmiyyət verdikləri halda, Bakıyı zikr etmiyorlar.

Fəqət bununla bərabər Bakının bir liman olaraq olduqca böyük əhəmiyyət peyda elədigi zamanlar da olmuşdur. Moğol istilasından sonra Bakı Xəzər dənizinin qərbi ilə şərqi arasında bir ticarət və tranzit mərkəzi olduğundan burasına diqqət verilmişdir.

İran, Turan, Xəzər, Rusiya məmləkətləri arasında bir ticarət deposu halını alan Bakı o dərəcədə əhəmiyyət peyda eləmişdir ki, Xəzər dənizinin bir adı da "Bakı dənizi" olmuşdur.

Bakının islamiyyətdən sonrakı tarixinə və buradakı asarə baxıldıqda burası Şirvanşah namilə hökumət edən bir sülalənin ikinci paytaxtını təşkil eləmişdir. İçlərində Məlik

---

[1] Hüseyn Hüsaməddin, "İqdam" qəzetəsi

Mənuçöhr, Şah Xəlilullah kibi elm, ürfan dostu olan şirvanşahlar əsasən Şamaxıda oturuyorlardısa da, Bakı dəxi bəndər olduğundan burasına dəxi əhəmiyyət veriyor, əksərən buraya gəliyor, iqamət edərlərdi. Şah məscidi, Xan sarayı və sonra Şah olan bağları Şirvanşahlardan qalma baqiyatdır. Şah məscidi ilə Xan sarayının tərzi-memarisindən dəxi görüldügü vəchlə Şirvanşahlar zamanında Bakı olduqca məmur bir bələdə halında olub, came və mədrəsələri məruf imiş. Qamusların göstərdiginə görə Şirvanşahlar altıncı əsr hicridə buralarda hökmran olmuşlardır.

Məscidi-camein əski binasında mövcud olan kitabələrdən dəxi camei-məzkurun 5-ci əsr hicridə bina edildigi görülməkdə idi.

893 səneyi-hicrisində Müluki-səfəviyyənin cəddi olan Şeyx Heydər tərəfindən Şirvanşah üzərinə hücum vaqe olmuşsa da, Ağqoyunlu Yaqubxan imdada gələrək şeyx mumiileyh məğlub edilmişdir. Fəqət sonra Şah İsmayıl atasının intiqamını almaq üçün Şirvana qoşun çəkərək 906-cı tarixdə Şirvanşahı məğlub etmişdir. Bu məğlubiyyət şahi-məzkurun vəfatına səbəb olduğu kibi, Bakı qələsinin də səfəvilər əlinə keçməsinə bais olmuşdur. Şəhəri zəbt edən səfəvilər burada mövcud olan sərvət və samanı nəql eləmişlərdir.

Şah İsmayıl Saninin qətlindən sonra bəradəri Məhəmməd Xudabəndə İran təxtinə cülus eləmişdi. Fəqət bəradərinin qətlinə mucib olan daxili ixtilal daha sükut bulmadığından İran məmləkətinə bir az zəif gəlmişdi. İstanbul cahangirləri bu zəifdən istifadə edərək Sultan Murad Salisi İran səfərinə təşviq eləmişlər. Nəhayət, Soqqulu Məhəmməd paşa kibi dərayət sahibi ricalının sözünə baxmayaraq padşah Lala Mustafa paşa komandasında böyük bir ordu tədarük etdirərək İran səfərinə icazə vermişdir. Lala Mustafa paşa ordusu ilə bərabər 986-cı səneyi-hicridə Qafqasiya təriqilə İran hüduduna gəldi.

Gürcüstan bəyləri Osmanlı ordusunu hüsni-istiqbal edərək məşhur Özdəmir oğlu Osman paşa komandasında bir ordunun Qazax, Gəncə, Ərəş təriqilə Şərqi Zaqafqasiya səmtinə keçməsinə yol verdilər. Özdəmir oğlu Osman paşa burada sənələrlə hərb edərək iranilərlə çarpışdı. Şirvan, Gəncə kibi şəhərlər dəfələrlə əldən-ələ keçdi. Nəhayət, Özdəmir oğlu Osman paşa Dərbəndi kəndisinə iqamətgah qərar verərək orada oturdu. Krım tatarlarından kəndisinə kömək gələrək İran qüvvətlərilə hərb elədi. 987-ci sənədə Dərbənddən qalxaraq Krım xanı Məhəmməd Gəray xan ilə bərabər Şirvan üzərinə yürüdülər. Osman paşa əvvəlcə Bakı üzərinə bir müfrəzə çıxarmışdı. Bu müfrəzə Bakıyı aldı. Mühafizləri olan Xan Əli ilə Məqsud Soltanı və sair zabitləri məmləkətin əyanı ilə birlikdə Şamaxıya əsir gətirdi.

Krım tatarları adətləri vəchilə Özdəmir oğluna müavinət üçün gəliyor və yığma ediyor, təkrar geri dönüyorlardı. Bu dəfə də öylə yapmışlardı. Tatarların döndügünü xəbər alan İran qüvvətləri Şamaxının istirdadını düşünmüşlər, tədarükə başlamışlardı. Bunu xəbər alan Özdəmir oğlu Şamaxının müdafiəsi üçün məxsusi qüvvət ayıraraq düşməni dəf edə bilmiş, kəndisi ləvazim və tədarükünü düzəldə bilmək üçün Dərbənddən Bakıya enməyə qərar vermişdi. Osman paşa o qışı (987-988) zərərsizcə Bakıda keçirdi. Vaqiənəvis Əbdürrəhman Şərif bəy əfəndi "Tarixi-Osmani Əncüməni-məcmuəsi"ndə bu xüsusda diyor ki: "Özdəmir oğlu Dəmir Qapıdan Bakıya endi. Xarab olan qələsini təmir və dağılan əhalisini təmin və cəm elədi. Bakı əhalisinin sərvəti-təbiiyyəsindən istifadə çarələrini düşündü. Neft mənbələrini zəbt ilə müqatiəyə bağladı. İpək məhsulatını vergiyə tutdu və sair vergiləri tənzim edərək xəzinəyə xeyli gəlir çıxartdı. Əskərlərin məvacibini və qələ

təmirində çalışdırdığı əmələnin üçrətini vermək üçün kafi miqdarda sərmayə hasil olmuşdu".

O qışı Bakıda oturmaqla bərabər Kür nəhrinin ötəsində qüvvət toplamaqda olan Salman xanı dəxi rahət buraxmaq istəməyib Qazi Gərayı bir miqdar əskərlərlə onun üzərinə göndərmişdi. Salman məğlub edildi. Bunun üzərinə təkrar zübdə bir qüvvət təşkil edərək Salman xan ilə bərabər Pirə Məhəmməd xan komandasında qüvvətli bir ordu ilə iranilər təkrar Kür nəhrini keçərək Şamaxı üzərinə yürüş etdilər. Şamaxı müqabilində vaqe olan böyük bir müharibədə Osmanlı qoşunu məğlub olub ordu rüəsasından çox az adam qurtula bildi. Bu qalibiyyət üzərinə Pirə Məhəmməd xan Şabranı təkrar ələ keçirmiş və Osmanlı fərarilərini qovaraq Dərbəndə qədər ilğar eləmişdi.

Bunun üzərinə İran xanları müşavirə edərək Bakı mühasirəsinə qərar vermiş və bu tərəfə qoşun çəkmişlərdi. Bakının bu mühasirəsini isə Əbdürrəhman Şərif bəy böylə təsvir ediyor:

"Mühasirədən əvvəl Osman paşa Dərbəndə getmiş və Bakı mühafizəsinə bahadirani-üməradan Əhməd bəyi təyin və iqamə eləmişdi. Bakı mühasirəsi çox şiddətli olmuşdur. (988-ci ilin axırları). Mühasirə qırx gün davam eləmişdir. İranilər qələyi almaq üçün nərdəban qurmaq və topraq sürmək kibi müharibə tədbirlərinə müraciət etmişlərdir. Məhsurin bir müddət şücaətlə səbat göstərmişlərdir. Lakin ərzaq və mühimmatları kafi miqdarda degil idi. Şəhər əhlindən birisi ox ilə məktub atıb qələ içindəki müzayiqəyi mühasirinə xəbər verər və onları yürüşə dəvət elər idi. Zaman oldu ki, məhsurin bəndərdəki gəmilərə minib kəndilərini xilas etsinlər. Lakin Əhməd bəyin əzm və şövq və casusun bulunub da odda yandırılması surətilə məcazat edilmiş və bun-

dan sonra qələ əhvalından məlumat ala bilməyən iranilərin məyus olaraq mühasirədən əl çəkmələri Bakıyı qurtarmışdır. İran sərdarı Pirə Məhəmməd xan Bakı mühasirəsindən qayıdanda Şabranda vəfat etmişdir. Bu adam səfəvilərin sınanmış sərdarlarından idi. Oğlu nəşini alıb İrana göndərmişdir".

Bu surətlə Bakı qələsi 989-cu ildən etibarən Osmanlı təhti-idarəsinə keçmişdir. Bakı 23 sənədən ziyadə Osmanlı idarəsində qaldıqdan sonra Türkiyə ilə İran arasında əqd olunan müsalihə icabı olaraq Osmanlı ordusu buralardan çəkilərək Bakı təkrar səfəvilərin idarəsinə keçmişdir. 1017 tarixli bir kitabə şəhər surinin Birinci Şah Abbas səfəvi tərəfindən təmir edildigini göstərməkdədir.

## IV

Səfəviyyədən sonra bu tərəflərdə təvaifi-müluk əmələ gəlib Azərbaycan vilayətləri birər müstəqil və nim müstəqil xanlıqlar halında yaşarkən Bakı dəxi uzun bir zaman xanlıq halında yaşamışdır.

Bakının o zamanlarda nə kibi bir həyatla yaşadığını məşhur türk səyyahından ögrənə biliyoruz:

1057 səneyi-hicrisində Bakıya gəlmiş Osmanlı səyyahi-şəhiri Övliya Çələbi həzrətləri Bakı qələsini bir vəchiati tərif ediyor: "Bakı qələsi Şirvan əyalətində olub Əcəm (İran) sərhədidir. Burada bir ziyafət edilib təamdan sonra Ərzurum valisi Məhəmməd paşa əfəndimizin naməsini inci (mirvarid) təsbehlə, məvac ipəkli firəng xaraların şəmşiri-hədayəyi xana verdim. Səfasından: "Xeyri-müqəddəm, xoşqədəm gətirdiniz" – deyə dilnəvazlıqlar etdi. Təbriz və Naxçıvan xanlarının namələrini də verdim. "Suriniz mübarək ola" – deyə

çox sənaxanlıq elədim[1]. Zatən namələrdə də həqiri xeyli tovsif etmişlər. Rəvan xanı[2] həqiri kəndi həmşirəsi sarayına mehmanlığa verildi. On gün, on gecə zövqü-səfalar etdik. Xan isə göstərmədik xan və sultan[3] qoymadı. O gün həqirə mülaqat əcəmanə əlbəsə, on tümən bəxşeşi şahanə ehsan olundu. Rəfiqlərimizlə şəhəri tamaşaya başladıq.

"Bakı qələsi Moskov kralına qarşı Dara şah tərəfindən Bəhri-Xəzər sahilində bir püşteyi-ali üzərində mürəbbülşəkl olaraq bina edilmiş bir qəleyi-rənadır. İç qələsinin qərbə nazər bir qapısı vardır. Hədidi naxçıvanidəndir[4]. Mühiti yeddiyüz addımdır. Yetmiş qələ altıyüz bəddəndir. Divarın qəddi yüz zərai məkidir. Qaya üzərində olduğundan xəndəyi yoxdur. Qələ içərisində topraq örtülü yetmiş qədər əski ev vardır. Heydər şah camei adilə bir də came varsa da, minarələrdir. Xan karvansara, hamam və sairədən nişan yox. Lakin dərya kənarındakı ribat[5] böyük karvansarası, bin qədər evli, bağ və baxçası, came, xan və hamamlı çarşı və bazarlı bir şəhər məmurdur ki, üç tərəfi sur ilə mühafizəli olub üç qapısı vardır. Şimala açılan Gilan qapısı, cənuba Babüləbvab qapısı, qərbə dərya kənarında liman qapısıdır. Buradan yeddi ədəd böyük minarə görünməkdə idi, üç hamamı varsa da, Mirzəxan hamamı qayət xoşdur. Çarşı və bazarı o qədər müzəyyən degildir. Lakin Moskov sərhəddi olduğundan şahsevən, dizçökən əskərləri vardır. Şirvan əyalətində başqaca xanlıqdır. 3 bin əskər və 12 hakimi (uyezd naçalniki) vardır.

---

[1] Övliya Çələbi Bakıya gəldigi zaman xanın toy məclisi varmış.

[2] Övliya Çələbi Rəvan xanı ilə birlikdə Bakıya varid olmuşdur.

[3] Sultan İran nizamincə bir mənsəbdir.

[4] Naxçıvan dəmirindəndir.

[5] Şəhərin əskəri olmayan digər qismi ki, o da hasarlı imiş.

Başqaca qazısı və 7 nahiyəsi vardır. Bir qaç kərə Moskov qazağı qarşı İdil nəhrindən şaykalar ilə gəlib Gilanı və Bakı nahiyələrini nəhb və qarət etmişdir. Çünki qarşı tərəfi 300 mildə Moskov diyarıdır. Hətta bu qələyi Özdəmirzadə fəth etmiş, içində osmanlılardan Qubad paşa hakim ikən Əcəmin (İranın) təşviqilə Moskov qazağı gəlib Bakı qələsini mühasirə etmişsə də, onlarla bərabər əcəmlər də dəndan tiğdən keçirilmişdir. Hala gəmikləri sahili-bəhrdə bir püşteyi-ali üzərində durur. Şəhərin havası səhləcədir. Çünki qəzalarında pirinc, kətan, yağ, bostan hasil olur. Amma suyu neft yağı qokar. Şəhər qərbində yeddi yerdə neft mədənləri vardır ki, hər biri bir lövndir, sarı, qırmızı, qara... ilaxır. Nahiyələrində misgər, misdan, riynəb, nəvahisi əhalisi şəmi-əsəl, şəmi-ruğən yaqmayıb həp qara neft yağı çıraqda yakarlar. Xalqı qayət təndürüst vətənpərvərdir. Olduqca dilbəri də vardır. Şəhəri on səkkizinci iqlim ərzi-hüdudundadır. Əhalisi əksəriyyən sünnüdür. Bu qələ ilə Dəmir Qələ arası dərya kənarından dörd mənzildir. Aralarında Misgər nahiyəsinin kəndləri məmurdir. Əhalisi köçbə türkmənlərdir. Obalarilə qonub köçərlər. Şabran şəhəri Bakının şərqində və üç mənzil məsafədədir. Şamaxı şəhəri də şərqində olub 5 mənzildir. Gilan da şimalındadır. Bakı Şamaxının bəndər iskələsidir. Cin və Xatai ilə Xətəndən, Qəfur eli ilə Rənan şəhərlərindən Qalmax (Kalmıq) və Moskov diyarlarından daima elçilər və karvanlar məta gətirərlər. Moskovlar daima Bakıya gəlib Bakıdan tuz (duz), neft, zəfəran, ipək (hərir) alıb Moskovaya götürüyorlar. Moskov elçiləri gəlib rəhn (girov) dururlar. Moskov diyarından səmur, balıq dişi, sincab əksəriyyən İrana Bakıdan çıxarılır. Bir qismi də Gilandan çıxar. Bakı nahiyələrində bəzi şora yerlər vardır. Adam və ya at ayağını basıb bir az dursa ayaqları yanar. Karvan xalqı

bəzi yerləri həfr edərək (qazıyaraq) təncərə (qazança) qoyur, təamları zəminin hərarətindən bir anda bişər. Əcayib hikməti-xudadır.

Bəzən Moskov qazağı kənarı sazlı gəmilərlə Kür nəhri ilə gəlib Bakı ətrafını nəhb və qarət edərlər.

Buradan aldıqları əsirləri Gilan bazarına aparıb orada satarlar. Nəhrin eni Tuna qədər varsa da dərinligi o qədər degildir".

Övliya Çələbi bu təfsilatı verdikdən sonra səyahətinin xatiməsini təsvir üçün yazıyor ki:

"Bir yandan şəhərə tamaşa etdigimiz kibi digər tərəfdən də Əcəm surlərinin (ziyafətlərinin) zövq və səfalarına qoyulduq. Suri-zifafi təhrir eyləsən böyük bir kitab olur. Rəvan xan (Tağı Əli xan) ilə Bakı xanı (Əşrəf xan)dan səmur əcəmanələr, kürçilər, tavus dəvələr ehsan aldıq. Rəvan xan dəxi Kəmər ki, bin baş karvan göndərməgi təəhhüd edərək Paşa əfəndimizə bir səmur kürk, on çift Gilan yayı, altı gürcü qilami, on cift balıq dişi, üç ənbər şamama hədaya verdi.

Ayrıca məhəbbətnamələr də təhrir elədi. Həqirə dəxi on tümən bəs xərcirah təvabelərimizə on tümən abbası ehsan elədi. Cümlə Bakı əyanı ilə vidalaşaraq qiblə tərəfə rəvan olduq".

Övliya Çələbi Bakının neftindən də təfsilat veriyor, onun səyahətnaməsinə görə:

"Neft yağı mədənləri yerdən qaynayaraq çıxar. Kiçik göllər neft yağı suların üzərində qaymaq bağlar. Neft başqaca əmanət olub sənəvi şaha yeddi min tümən ağça gətirir. Nefti-əmniyyənin adamları bu gölçügizlərin içinə girib gecələri nefti yığaraq keçi tuluqlarına doldururlar. Sonra bunu tüccar alıb diyar-diyar götürürlər. Səkkiz rəngdə neft olur. Lakin sarı neft qayət məqbuldur. Siyah neft şahlıqdır ki, İran diyarının, Özbəkistan, Hindistan, İraq, Kürdüstan, Gürcüstan, Dağıs-

tan, Ali-Osman sərhədlərindəki qələlərə bu qara nefti götürüb ətraflarına çırağban edərlər. Əskər üzərlərinə hücum etdikdə üzərlərinə və ayaq altlarına neftli yorğan və köhnə əşya atıb atəşbazlıq edərlər. Neft qələ və şəhər mühimmatı üçün lüzumludur. Hətta şah hüzurində, dəri-dövlətlərində yanan məşəllər həp Bakı neftindəndir. Neftin gecəli, gündüzlü nigəhbanları vardır. Çünki atəş dəgərsə ila nəhayə yanıb sönmək bilməz. Onun üçün neft mədənlərinin kənarında dağlar kimi qum təpələri amadə durur. Neft mədəninə bir şərarə isabət eləsə haman cümlə riaya yetişib üzərinə topraq ataraq söndürürlər. Başqa əlacı yoxdur".

Övliya Çələbinin səyahətnaməsində bu qədər tərif olunan Bakı nefti həqqində ərəb coğrafiyaçıları da məlumat vermişlərdir. Məsudinin "Mürücüz-zəhəb"ində bu xüsusda təfsilat verildigi kibi, Yaqut Həməvinin "Möcəmül-Belda"nında izahat vardır. Yaqutun izahatına görə Bakıda başlıca iki neft mənbəi varmış ki, birindən sarı və ya ağ neft, digərindən qara, yaxud yaşıl neft çıxarmış. Məsudi buradan başqa heç bir yanda ağ neft çıxmadığını da əlavə ediyor.[1] Hicri doqquzuncu əsrdə Əlbakuvinin yazdığına görə gündə çıxarılan neftin miqdarı iki yüz qatır yükü imiş. "Dərbəndnamə"dən iqtibasla Məhəmməd Cavad bəy diyor ki, Bakıdakı neft mənbələri ilə duz mədənləri Dərbənd əhalisinə aid bir vəqf idi. Hicri 1003 tarixli bir kitabədən çıxarılan məlumata görə bunlar seyidlərə təxsis edilmiş bir vəqf imiş.

Şah İsmayıl Səfəvi imzasilə idareyi-ruhaniyyə quberniya məclisi dəftərxanəsinin övraqi arasında məhfuz və saiqə nəzərən neft quyularından bir neçəsi Tazə Pir həyatində mədfun bulunan Şeyx həzrətlərinə vəqf edilmiş imiş.

---

[1] "Aqşam" qəzetəsi, Köprülüzadə Məhəmməd Fuad

## V

Övliya Çələbi mərhumun hekayəsindən də anladıq ki, ruslar Bakının neftinə pək əski zamandan bəri göz dikmişlər və uzaq zamanlardan bəri burasına bir takim hücumlar və təcavüzlərdə bulunmuşlardır.

1000 sənə əvvəl 914 səneyi-miladisində knyaz İqor zamanında ruslar Bakıya doğru bir səfər eləmişlərdir.

942-ci sənədə Bakı və Şirvan vilayətinin zənginligi təkrar rus kazaklarının təməini cəlb edərək buralara akın eləmiş və Kür nəhri ilə ta Bərdə şəhərinə qədər enmişlərdir.

1553-cü sənədə Hacıtərxan ruslar tərəfindən alınmışdır. Hacıtərxanın alındığını mütəaqib ruslar İran ilə münasibati-tüccariyyəyə girmək istəmişlər. Bu səbəblə də Bakı bəndərinə hücumları artmışdır.

17-ci əsrdə Bakı ilə Şirvan məşhur Stepan Razin komandasındakı kazak aqınçılarının təərrüzlərinə düçar olmuşdur. Razin dəstəsi şlyupkalarla Bakı sahilinə eniyor, Kür nəhrinə gəliyor, sahilləri yağma və tarac edərək müvəqqəti qələbələr ehrazından sonra qoyub çəkiliyorlardı.

Böyük Petro siyasi geniş planlarının cüzində Xəzər dənizinə çox əhəmiyyət verirdi. Burası Şərq məmləkətlərilə bir ticarət yolu idi. Hacıtərxan voyovodası Musin-Puşkinə 1700-ci ildə əmr edilmişdi ki, tariqi-Şamxali ilə münasibati-tüccariyyədə bulunsun. Bu andan etibarən Orta Asiya məmaliki ilə münasibati-tüccariyyəyi artırmaq çarın daimi düşüncəsini təşkil eləmişdir. Bu məqsədlə 1715-ci ildə knyaz Bekoviç-Çerkaskiyə əmr edildi ki, Orta Asiyaya doğru səfərə hazırlansın. Kəndisinə eyni zamanda bu da tapşırıldı ki, Ceyhun nəhrini əski məcrasına salaraq Xəzər dənizinə axıdılması üçün tədbirlər görsün. 1718-ci sənədə yenə böylə bir məqsədlə

Volınski səfirlik sifətilə İrana göndərildi. Volınski İran ilə təfsilən tanış oldu. Eyni zamanda Petroyu Xəzərin sahillərini tutmaya təşviq elədi. Yoxsa buralarını əfqanlılar tutacaqlar – deyə çarı əndişəyə buraqdı.

Çar Volınskinin tövsiyələrinə qulaq asdı. Bilxassə ki, Şamxal Ədil Gəray bütün Dağıstan cəmaətləri naminə elçi göndərib ərzi-tabeiyyət eləmişdi.

Bunun üzərinə Petro Volınskiyə İran səfərinə hazırlanmayı əmr eləmişdi. Səfər hazırlanmış, fəqət sonra İrana hərb elan etmək niyyətindən vaz keçilərək Dağıstana gəlməklə iktifa edilmişdi. Böyük Petro 1722-ci ildə Tariqi-Şamxal Ədil Gərayın dəvəti üzərinə Dağıstana gəldi. Sulaqda istiqbal edildi. Sonra çarın məhfili Dərbəndə doğru getdi. Yolda Qaytak xanı Soltan Mahmud müqavimət göstərdigindən dəf edildi. Böyük Petro Dərbəndi alıb oradaca qışlamışdı.

Petro Bakıya çox böyük əhəmiyyət veriyordu. Çar general Matuşkinə əmr eləmişdi ki:

"Təcilən Bakıya get, məzkur şəhəri al, Allah yardımçın olur. Şəhərin açarlarını alır, göndərirsən".

1723-cü ildə Matuşkin Bakıyı almışdır. O sənədə İran ilə əqd olunan bir müqavilə mövcibincə Bakı ilə Dərbənd Rusiyaya tərk edilmişdir.

1732 və 1735-ci sənələrdə çariça Anna İvanovna zamanında əqd olunan Rəşt müahidənaməsinə görə Bakı, Quba və Dərbənd təkrar İrana qaytarılmışlardır.

Bu surətlə Şimali Azərbaycandan çəkilmiş olan Rusiya Böyük Yekatrina zamanında təkrar ovdət eləməgə başlamışdır. 1796-cı sənədə general Zubov Dərbəndi almışdır.

1801-ci ildə Gürcüstan Rusiyaya iltihaq etmişdi. Bu hal üzərinə bugünki Azərbaycan Cümhuriyyətini təşkil edən Azərbaycan qitəsi, bilxassə hər növ hücumlara məruz qalan

Bakı-Şirvan vilayəti artıq iki atəş içində qalmışdı. Şu sırada rusların Qafqaziyadakı ordularının komandanlığına məşhur Sisiyanov təyin olundu. Sisiyanov bir kərə Rusiya əlinə keçmiş olduğu halda tərk olunan Bəhri-Xəzər sahillərini təkrar zəbt etmək fikrinə düşdü. 1805 sənəsi yaz zamanı general-mayor Zavalişin komandasında 500-dən ibarət bir qüvvə toplayaraq gəmilər vasitəsilə Bakı üzərinə göndərdi. O zaman Bakının xanı Hüseynqulu xan idi. Zavalişin Bakıya yaxınlaşınca Qubadan Bakıya kömək gəldigini xəbər aldı. Bu xəbəri alınca təərrüz etmək cəsarətini göstərmiyərək şəhəri qoyub çəkildi.

Zavalişinin bu surətlə çəkildigini xəbər alan general Sisiyanov bərk acığı tutmuşdu. Xəstəligınə baxmayaraq Zavalişinə şiddətli itablarda bulundu. Qış düşdügünü aldırmayaraq 1500-ə qədər piyada, 200 atlı kazak və ona qədər top ilə özü bizzat Bakı üzərinə gəldi. Dekabr ayı idi. Sisiyanov bilirdi ki, şiddətli hərəkət etməzsə Zavalişinin ricəti yeni ram edilmiş Bəhri-Xəzər sahilindəki xanlara suyi-təsir hasil edər, hərəkətə gələrlər. Bunun üçün o, rus silahının nüfuz və etibarını qüvvətləndirmək istiyordu. Sisiyanov Hüseynqulu xan ilə sabiqən də tanış idi.

Xana xəbər göndərdi ki:

"Bakıya gəlirəm, ya Bakıyı alacağam, ya ki orada öləcəgəm".

Yol üzərində Sisiyanov Şamaxı xanı Mustafa xanın beyətini aldı. Şamaxı dağlarını enərək Bakı xanlığına daxil oldu. 1806-cı sənəsi yanvarının axırlarına tərəf Sisiyanov Bakı surləri yanında idi. Hüseynqulu xan xəbər göndərdi ki, şəhəri təslim ediyor. Kəndisi də tabe oluyor. Fevralın 8-nə şəhərin təslimi üçün gün təyin olunmuşdu. Təyin olunmuş gündə rus tarixlərinin yazdığına görə Sisiyanov yavərlərindən yalnız Eristov ilə birlikdə bir də bir kazak nəfəri ilə bərabər Bakının qapısına doğru getdi.

Orduyu kəndisindən uzaq bir məsafədə buraxdı. Hüseynqulu xan da kəza kiçik bir məiyyətlə bərabər olduğu halda knyazı istiqbal elədi. Tərəfeyn yaxınlaşmca xanın nökərlərindən birisi tapança ilə vurub generalı haman oradaca öldürrdü. Onun ardınca Eristov da öldürüldü. Kazak qaçdı.

Generaldan sonra rus ordusunun komandanlığı vəzifəsində olan Zavalişin özünü o dərəcədə itirdi ki, bütün əskərlərini toplayıb tələsik gəmilərə oturdaraq Tariqi-Şamxallığı vasitəsilə rus cəbheyi-əsliyyəsinə çəkildi.

Sisiyanovun sözü doğru çıxdı. "Bakıda öldü". Bu vaqiə həqqində tarixdə bir "ləjan" (mənqəbə) dəxi rəvayət olunmaqdadır.

Sisiyanovun başı kəsilərək Hüseyn xan tərəfindən şaha göndərilmişdi.

Fətəli şah, rəvayət ediyorlar ki, qış gecələrindən birisində qarşısında manqal Qafqasiyadan alınan nagüvar xəbərlər üzərinə uyumayıb sabaha qədər əlində maşa odu, külü qurdalayaraq mükəddər və dalğın bir vəziyyətdə oturmuş, nagah sabah xoruzlarının banladığını görüncə maşayı manqala vuraraq:

– Ey xuda, ya mərabikeş, ya urra!... – deyə təğəyyür eləmişdir.

Günəş doğunca general Sisiyanovun kəsilmiş başı paytaxta gəliyor – deyə xəbər alınmışdır.

General Sisiyanovun bu macərasını və Zavalişinin o surətlə qayıtmasını xəbər alan general Qlazanap bu vaqiədən Rusiya etibarı üçün hasil olacaq suyi-təsiri idrakla bir qüvvə toplayıb Bakı üzərinə hərəkət elədi isə də, Tariqi-Şamxalının tədbiri və dostluğu sayəsində yalnız Dərbəndin açarlarını bilahərb və müqavimət təsliminə aldı. Quba ilə Bakıya doğru isə hərəkət edə bilmədi.

Sisiyanov əvəzinə Gürcüstan komandanlığına general Qudoviç təyin olundu. Qudoviç üçüncü dəfə idi Qafqasiyaya gəliyordu. Qudoviç Qlazanapı çıxarıb yerinə Bulqakovu təyin elədi. Bulqakov Bakı üzərinə gəldi. Şəhər müqavimət göstərməyib təslim oldu. Anlaşıldı ki, general Sisiyanovun qətli Hüseynqulu xanın rizası və xəbəri olmadan qardaşının Əmir Həmzə adında bir nökəri tərəfindən xudsəranə bir surətdə icra edilmişdir.

Bakı 1806-cı sənəsi sentyabrın 3-də təslim olunmuşdur.

Bakıdan sonra Quba xanlığı dəxi bilahərb təslim olmuşdur.

General Sisiyanovun başsız bədəni əvvəlcə gömülmüş olduğu məzarından çıxarılaraq erməni kəlisasında dəfn olunmuş, sonra da 1811-ci ildə Tiflisə nəql ilə Siyon kəlisası dairəsində dəfn olunmuşdur.

Bildigimiz Sisiyanov fontanı haman məqtul generalın naminə olaraq yapılmışdır.

1812-ci ildə Gülüstan müahidənaməsi mövcibincə Dərbənd, Quba, Gəncə, Şəki, Şirvan xanlıqları ilə bərabər Bakı dəxi qəti surətdə Rusiyaya tərk edilmişdir.

## VI

Qədim zamandan bəri gözünü qıcadığı Bakıya bu surətlə malik olduqdan sonra Rusiya hökuməti yüz sənəyə qədər burasını əldə bulundurmuşdur. Bu zamanda Bakı idarətən şəkildən-şəklə girmişdir. İbtidada Prikaspiyski kray denilən vilayətin mərkəzlərindən birisini təşkil edərək bədə Şamaxı quberniyasının uyezd şəhərlərindən birisi hökmündə qalmışdır. Daha sonra böyük Şamaxı zəlzələsini mütaqibən Bakı quberniya mərkəzi olub qubernator dairəsi də buraya kö-

çürülmüşdür. 1907-ci ildə Bakının gündən-günə artmaqda olan əhəmiyyəti-fövqəladəsi nəzərə alınaraq qradonaçalstvo namilə qubernatora tabe olmayaraq bir vilayəti-mümtaza halına qoyulmuşdur.

Bakı mühüm bir ticarət mərkəzi və ələlxüsus nefti ilə məruf olaraq cahanca şöhrət bulmuşdur.

Neftindən əlavə ta qədimdən bəri İran, Türküstan, Rusiya yolları üzərində bir nöqteyi-müvasilə və münaqilə olduğundan əlavə burası Qafqasiya müsəlmanlarının ələlümum və Azərbaycan türklərinin ələlxüsus mühüm bir mərkəzi-ürfanı olmuşdur.

Yeni Azərbaycan məktəbi, mətbuatı, ədəbiyyatı, sənayeinəfisə və səhneyi-tamaşası həp burada nəşvü-nüma bularaq nəhayət, Azərbaycan təşkilati-ictimaiyyə, iqtisadiyyə və siyasiyyəsi dəxi burada bina tutmuşdur.

Rusiya inqilabı zühur etdikdə ilk Zaqafqasiya qurultayı burada toplanıb mərkəzi müsəlman komitəsi dəxi burada təsis etmiş, Azərbaycan muxtariyyət fikri burada möhkəmləşərək muxtariyyətçilər burasını Azərbaycan bədəninin ayrılmaz bir təfləsi, paytaxtı elan eləmişlərdir.

Bu fikrə qarşı mübarizə edən bütün rusiyaçı firqələr müxtəlif növ və şəkillərlə Bakının Azərbaycan paytaxtı fikrinə qarşı mübarizə eləmişlər, bu məqsədlə də Bakı türklərinin başına mart faciəsini açmışlar və bakılı müsəlmanları altı ay tamam təzyiq və əsarət altında bulundurmuşlardır.

Nəhayət, Bakıyı qurtarmaq üçün yeni təşəkkül edən Azərbaycan hökuməti Türkiyə dövlətinə müraciət eləmiş, igid qardaşlarımız vaxtında yetişərək Nuru Paşa, Mürsəl Paşa və Xəlil Paşaların komandasında olaraq 1918 sənəsi sentyabr ayının 15-də qanlı bir müsadimədən sonra Bakı təkrar əsl sahibi olan Azərbaycan türklərinin əlinə keçmişdir.

Bakının istirdadı Azərbaycan istiqlalının yüzdə doxsan təmyini-istiqlal elədigi gündür.

Bakının əhəmiyyəti işbu müxtəsər mütaliədən gördügümüz kibi yalnız keçmişdə degil, daha böyük vəzifəsi gələcəkdədir.

Müqəddimatən Bakının azərbaycanlılardan ötrü bir amal məscidi olduğunu zikr eləmişdik. Fəqət doğru və daha səhih bir təriqlə:

Bakı türklügün şahrahı üzərində vaqe sınmaz atəşlərilə yanan bir amal məşəlidir ki, həpimizin diləgi onun bütün Azərbaycan və bütün türklük üçün daimi bir surətdə işıqlanmasıdır!

**M.Ə.Rəsulzadə**

***"Azərbaycan", 2, 6, 19, 31 dekabr 1918,***
***7 fevral 1919, №55, 57, 68, 75, 108,***
***"İstiqlal" məcmuəsi, 28 may 1919, №1***

Rüəsa – rəislər
Müzayiqə – çətinlik
Sur – qala divarı
Təəbbüd – ibadətlə məşğul olma
Münqəbə – sərt, qaba, sıxılmış
Müsəmma – adlanma
Müərrib – tərcümə edən
Məvadd – maddələr
Həvali – ətraf
Zair – ziyarətçi
Məcus – atəşpərəst
Mücaviz – pir, məscid xidmətçisi
Mötəkif – ibadətlə vaxt keçirən
Etikaf – təklikdə yaşama

Xövf – qorxu
Zahib – gedən, yoxa çıxan, məhv olan
Müxəffif – yüngülləşdirən, asanlaşdıran
Bilad (bələd) – ölkə
Məmurə – tikintili, abad
Müqəyyid – qeyd edilən
Mülhəqat – qatılmış, ilhaq edilmiş
Zikr – adını çəkmə, söyləmə
Cədd – ata, baba
Mumaileyn – yuxarıdakı, həmin
Müfrəz – dəstə, hissə
Üzar (izar) – yanaq
Ribat – möhkəm bina, bağ
Nəhb – çapobul
Əsəl – bal
Ruğən – yağ
Səmur – dərisi qiymətli bir heyvan
Zübdə – seçilmiş hissə
Mürəbbə – kvadrat, dördlük
Hədid – dəmir
Təndürüst – boylu-buxunlu
Suri – şadlıq, sevinc
Suri-zifaf – gəlinlə bəyin görüşdüyü ilk gecə
Hədoya – hədiyyələr
Ehraz – qazanma
Tariq – dan ulduzu, zöhrə
İtab – məzəmmət, danlaq
Reyət – icazə, tabe olma
Mənqəbə – hədsiz mədh, mədhiyyə
Ləjan – şişirtmə, mədhiyyə
Xodsəranə – özbaşına

Təsmiyə – adlandırmaq
Kan – mədən; mənbə
Dər – qapı

**Qeyd:** *M.Ə.Rəsulzadənin "Azərbaycan paytaxtı" məqalələrinin 5 hissəsi "Azərbaycan" qəzetində (№55, 57, 68, 75 - 1918, №108 - 1919), axırıncı hissəsi isə Azərbaycan Xalq Cümhuriyyətinin bir illik yubileyi ilə əlaqədar 1919-cu il mayın 28-də işıq üzü görmüş "İstiqlal" məcmuəsinin 1-ci nömrəsində dərc edilmişdir – Ş.H.*

## Tarix elmləri doktoru, "Bakının tarixi" əsərinin müəllifi Sara Aşurbəylinin rəyi

Məhəmməd Əmin Rəsulzadənin 1918-ci ilin axırları, 1919-ci ilin əvvəllərində[1] cap olunmuş "Azərbaycan paytaxtı" adlı məqaləsi Bakı – liman şəhərinin qədim zamanlarda çar Rusiyası tərəfindən 1806-ci ildə istila edilənə qədərki tarixinin işıqlandırılmasında ilk təşəbbüsdür. Müəllif məqalənin başlanğıcında Bakının coğrafi mövqeyini göstərməklə onun qədim zamanlardan yanar qazların sayəsində atəşpərəst zərdüştlərin və hinduların müqəddəs ziyarətgahı olmasından, kapitalizm dövründə neft maqnatlarının diqqətini cəlb edən sənaye mərkəzinə çevrilməsindən söhbət açır.

Daha sonra M.Ə.Rəsulzadə türk müəllifi Şəmsəddin Şami bəyin lüğətinə istinad edərək "Azərbaycan" sözünü izah edir və

---

[1] "Azərbaycan qəzeti" 1918-ci il dekabrın 2-dən 1919-cu il fevralın 7-nə qədər № 55, 57, 68, 75, 108.

onun izahını Təbriz şəhəri ilə yox, Bakı və Şimali Azərbaycanla bağlayır. Müəllif "Azərbaycan" sözünü odla əlaqələndirir və həmin sözü "Odu qoruyan" kimi şərh edir. M.Ə.Rəsulzadə məqaləsinin bu hissəsində həqiqətə daha çox yaxındır.

Məqalənin ikinci hissəsində müəllif fars, ərəb, türk müəlliflərinin Bakı haqqında müxtəlif məlumatlarını misal gətirir və belə bir fikrə gəlir ki, həmin sözün mənasını fars və türk dillərinin lüğət tərkibi əsasında izah etmək yanlışdır. O, "Azərbaycan" sözünün mənasını hind-qucarat ləhcəsi ilə bağlamağı daha düzgün hesab edir.

M.Ə.Rəsulzadə "Allahlar şəhəri", "Allahlar şəhərinin odları" kimi izah edilən "Baqavan"ın "Atəşi baqavan"ın və "Atəşi Baqua"nın adları xatırlanmış V-VIII əsr mənbələrindən misallar çəkmir. Bunlar Bakı toponiminin daha qədim və daha dəqiq adlarıdır. (Bax. S.B.Aşurbəyli, "Orta əsərlər Bakisının tarixi haqqında oçerklər" Bakı 1964, səh.35-46).

Daha sonra müəllif Qız qalası haqqında yazır və onu Bizans memarlıq üslubu ilə bağlayır. İçərişəhərin qapılarındakı rəsmlərin islama qədərki dövrə aid olduğunu qeyd edir. Bu fikir yanlışdır. Belə ki, həmin rəsmlər Şirvanşahların gerbidir və çox qədim deyildir. Qız qalasının isə Bizans memarlıq üslubuna aidiyyəti yoxdur və onun üzərində XII əsrdə tikilməsi göstərilmişdir.

Fəslin sonunda o, Bakının kim tərəfindən təməli qoyulduğunun məlum olmadığını yazır. Və şəhərin qədimliyi (bizim eradan əvvəl 978-ci il) haqqında rus lüğətlərindən misallar gətirməklə yanaşı, onun tarixini təxminən 1500 il bundan qabağa aid edir. Son məlumatlara əsasən, Bakı şəhərinin tarixi (Ş.Aşurbəylinin "Bakının tarixi" əsəri çapa hazırlanır) bizim eranın I əsrinə, onun yaranmasını isə Abşeronun başqa məskunlaşan əraziləri kimi tunc dövrünə aid etmək olar.

Üçüncu fəsildə müəllif Bakının liman kimi əhəmiyyətindən söhbət açır. Və eramızın VI əsrində hökmranlıq etmiş Şirvanşahlar haqqında qısaca məlumat verir. Həmin məlumatlar düzgündür. O, misal gətirir ki, Cümə məscidi üstündə qeyd olunduğu kimi hicri tarixi ilə V əsrdə tikilmişdir. Lakin fars mənbələrinə görə ərəb istilasına qədər Cümə məscidi zərdüştilərin məbədgahı olmuşdur.

Sonra müəllif Bakının Şah İsmayıl tərəfindən zəbt edilməsi, onun məğlubiyyəti və Şirvanşahın öldürülməsi haqqında məlumat verir, ardınca isə türk mənbələrindən dəqiq faktlar misal gətirməklə səfəvi-türk müharibələrinin Azərbaycan şəhərlərinin və Bakının osmanlılar tərəfindən istila olunmasını təsvir edir.

Müəllif dördüncü fəsildə 1647-ci ildə və sonralar Bakıda olmuş Evliya Çələbinin Bakı şəhəri haqqında dəqiq məlumatları barədə xəbər verir. Bakı və onun neft mədənləri haqqında verilən bu məlumatlar olduqca maraqlıdır. Və onlara öz dövrünün tarixi ədəbiyyatında ilk dəfə M.Ə.Rəsulzadənin məqaləsində rast gəlmək olar.

Beşinci fəsildə müəllif rusların Bakıya hücumlarından, Stepan Razinin gəlişindən söhbət açır. Sonra beş səhifə rus çarlarının Bakını almaq cəhdlərindən bəhs edərək I Pyotrun, general Zavalişinın, daha sonra Sisiyanovun Bakıya yürüşlərindən danışır. Və onun Hüseynqulu xan tərəfindən öldürülməsini, nəhayət, 1806-cı il sentyabrın 3-də general Bulanovun Bakını tutmasını qələmə alır. Məqalə Dərbəndin, Qubanın, Gəncənin, Şəkinin, Şirvan xanlığı ilə bir yerdə Bakının həmişəlik Rusiyaya birləşdirilməsini göstərən Gülüstan müqaviləsi barədə mülahizələrlə bitir.

Elmi cəhətdən müəyyən əyər-əskiyinə baxmayaraq, M.Ə.Rəsulzadənin bu işi Bakının tarixini işıqlandıran ilk

məqalə kimi çox maraqlıdır. Məqalənin məzmunundan görünür ki, onun müəllifinin Azərbaycan tarixi haqda ətraflı məlumatı olmuş, türk, ərəb, fars mənbələri haqda dərin biliyə yiyələnmişdir. Belə hesab edirəm ki, həmin məqalənin çapı indi böyük marağa səbəb ola bilər.

**Sara Aşurbəyli**
***AMEA-nın Tarix İnstitutunun aparıcı elmi işçisi, tarix elmləri doktoru***

**Qeyd:** *S.Aşurbəylinin bu rəyini mənə 1989-cu ilin noyabrında ADU-nun riyaziyyat fakültəsinin baş müəllimi Səfər İbrahimov vermişdi – Ş.H.*

## İran və biz

Hökumətimiz tərəfindən bu günlərdə İran paytaxtı Tehrana bir heyəti-mürəxxəsə göndərilmişdir.

Heyəti-mürəxxəsənin məqsədi yeni təşəkkül etmiş Azərbaycan Cümhuriyyətini İran hökumətinə məriflik edib də bu iki müsəlman dövləti arasında hüsni-münasibat təsis və təmin eləməkdir.

İran ilə dini, mədəni və tarixi münasibatımızdan əlavə sıxı bir müqəddərati-siyasiyyəmiz vardır.

İranın səlaməti bizim üçün, bizim səlamətimiz İran üçün son dərəcədə mühümdür.

Daima zərbələrini yedigi cahangir Rusiya yerində, iləridə yenə inkişaf etmək həvəsinə düşəcəgi mühəqqəq olan Rusiya ilə öz arasında müstəqil bir Qafqasiya görmək İranın əxsi-amalını təşkil eləməlidir. Müstəqil Qafqasiya içərisində müstəqil və nüfuzlu bir müsəlman hökumətinin vücudi isə bilxassə İran vətənpərvərlərini sevindirməlidir.

Biz əminiz ki, dərin düşünür İran mütəfəkkirləri bu sevincə yabancı degildirlər. Burada İranı təmsil edən siyasi nümayəndələrin hər münasibət kəsbincə ibraz etməkdə olduqları dostluq və qardaşlıq hissiyyatları bizə bu əmniyyəti veriyor.

Araz nəhrinin yuxarısında təşəkkül edən məhəlli bir islam cümhuriyyətinin hər halda İran üçün faidəli olacağı İran siyasiyyunundan ötrü şübhəli bir məsələ halında olmasa gərək.

Dini və mədəni münasibatdan əlavə İran ilə Cümhuriyyətimiz miyanında hər bir münasibatdan daha qüvvətli bir rabitə vardır: iqtisadi rabitə, İran bizimlə külliyyətli surətdə ticarət etməkdədir. Bakı bəndəri ta əski zamandan bəri İran ticarətinin ən mühüm bir qapısını təşkil edər.

Bakı mədənləri Şimali İrandan gələn əmələlərlə işlər, Bakı və Gəncə vilayətlərinin pambığı, buğdası və sair hübubatı İran Azərbaycanının əmələsi olmazsa toplanmamış qalır.

Bundan əlavə, cümhuriyyətimiz ilə şahlıq arasında ədəbi və tərbiyəvi böyük bir qərabət və münasibət vardır.

Ədəbiyyatımız, ədiblərimiz, şairlərimiz, mühərrirlərimiz – bilxassə əski məktəbdən yetişənləri – İran feyzi ilə pərvəriş bulmuşlardır. Firdovsi, Sədi, Hafiz, Ömər Xəyyam, Molla Rumi və sair İran səramədani-süxəni bizimkilər tərəfindən adətən bənimsənilmişlərdir. İçərimizdə İran üsuli tərbiyə almışlarımız, fars ədəbiyyatı ilə aşina mürafiələrimiz az degildir.

Hələ Nizami, Xaqani, Məhsəti kibi İran ədəbiyyati-qədiməsinin axırki dövrəsinə adlı şairlər yetişdirməklə də iftixar edəriz.

Azərbaycan ədəbiyyatının ustadi-əvvəli Şeyxüşşüəra Füzuli bu türk Hafizi bu gün Arazın şimalından ziyadə cənubunda mərufdur.

Nəbati, Raci, Məhəmməd Baqir, Dilsuz, Ləli və sair kibi Azərbaycan gülşəni-ədəbiyyatına başqa bir rəng və ruğən verən ədiblər İranın yetişdirmiş olduği güllər, çiçəklərdir.

Qafqasiya Azərbaycanı İrandan aldığı borcu mümkün olduğu qədər iadə etməgə dəxi çalışmışdır.

Yeni Azərbaycan ədəbiyyatının bərəkətli səhnəsini təşkil edən Bakı mətbuatı heç bir zaman İrana yabançı qalmamışdır. Burada nəşr olunan mətbuati-mövqutə hər zaman İran qüssələri ilə qüssələnmiş, onun sevincləri ilə sevinmişdir. Bunun üçün də o, İranda rəğbət qazanmış, bilxassə Təbriz Bakı mətbuatının ikinci mərkəzi-tovzii olmuşdur. "Molla Nəsrəddin" məcmuəsinin müvəffəqiyyəti isə İranın yalnız türkcə danışan şəhərlərinə degil, bütün mühüm mərkəzlərinə qədər şamil olmuşdur.

Nəbati bizdə olduğu qədər, Seyid Əzim də İranda mərufdur. Biz Ləliyi bildigimizdən ziyadə İran mərhum Sabiri tanır, "Hop-hop"un "Mən deyən oldu, sən deyən"ini hamı çocuqlar əzbərdən oxur.

Musiqimiz kəndinə məxsus bir xüsusiyyəti mühafizə eləməklə bərabər əsas etibarilə İran musiqisidir. Böylə ikən opera və operettalarımız vasitəsilə biz bu xüsusda dəxi müqabil bir təsir yapmaqla borcumuzu verməkdəyiz.

Dramaturqlarımızın yazdığı faciə və komedilər isə yalnız Təbrizdə degil, Rəştdə, Qəzvində, hətta Tehranın özündə belə müvəffəqiyyətlə tamaşa ediliyor. Aktyorlarımız, kəmali-məmnuniyyətlə qeyd ediyoruz, Tehranın bütün ədəbi məhfillərində məzhər qəbul olaraq hətta şah həzrətlərinin sarayına belə hülul eləmişlərdir.

Möhtəşəm bir tarixə, parlaq bir mədəniyyətə malik olan Şirü-Xurşid məmləkəti kəndinə müstövli olan istibdad sayəsində uzun bir inhitat dövrəsi keçirdi.

Bu dövrəyə bir intəha vermək qəsdilə İran milləti məşrutiyyət bayrağını qaldırdı. Cihada başladı.

Bakı mətbuatının bu yoldakı xidməti inkar ediləməz. Qafqasiya türklərinin fikri-hürriyyətlə məşbu olanları bir an əvvəl İrana atıldılar, dindaşlarına kömək etməyi bir vəzifəyi-vicdaniyyə bildilər.

Kəndi səadətini təmin üçün icra elədigi böyük mübarizədə, bir az da olsa, İran millətinə – bildigim və bacardığım qədər – yardım edənlərdən olmaqla iftixar elərəm.

Bu sənələrin, iranlı vətənpərvərlərlə bərabər çalışdığımız illərin, məhsulu olaraq iranlıların Qafqasiya müsəlmanları xüsusunda pərvərdə etdikləri hissiyyat və təmniyyat həqqində iyi xatiratım vardır.

Bu xatirat bənə həqq veriyor düşünüm ki, cümhuriyyətimiz tərəfindən İrana göndərilən heyəti-mürəxxəsə ümid etdigimiz hüsni-qəbulə məzhər olacaq. İranlı mütəfəkkir arkadaşlarımız, Bakıdan gələn bu heyətin dost və əqrəba bir milləti təmsil elədiginə qane olacaqlar və kəndisinə o surətlə müamilə edəcəklərdir.

Mütəfəkkir arkadaşlarımız – diyoram, çünki hər məmləkətdə olduğu kibi – bittəbii – İranda da səthi düşünür, fəqət mütəfəkkir keçinər adamlar yox degildir. Meydanda bir az da qəsdən suyi-təfəhhümlər və suyi-tavillər yayan və məxsusi məqsədlərlə düşmənanə fikirlər nəşr edən adamlar bulunursa – ki, böylələri məəttəəssüf az degildir – o zaman bu qəbildən olan mütəfəkkirlər haman mütaliələr yürütməgə başlar, nəticədə səmimiyyət və istilik əvəzinə quru bir rəsmiyyət və soyuqluq çıxar.

İştə quru rəsmiyyətlə iktifa etmədigimiz üçün biz burada kəndilərindən şikayət etdigimiz "mütəfəkkir"lərin cümhuriyyətimizin ismi həqqindəki tənqidlərinə bir az nəqli-kəlam etmək istəriz.

Bəzi İran mühərrirləri Azərbaycan Cümhuriyyətinin vücudunda İranın təmamiyyəti-mülkiyyəsindən ötrü "ələni" bir təhdid görüyorlarmış. Və Azərbaycan İranın bir vilayəti ikən bunu cümhuriyyətimizə "ələm" etdigimizə etirazları varmış.

Biz bu xüsusda vəqtilə – bir münasibətlə – izahat vermişdik. Azərbaycan derkən qəsdimiz Şimali Azərbaycan və yaxud Qafqasiya Azərbaycanıdır ki, əski Aran ilə Şirvan və Muğanı ehtiva edər. Azərbaycan ismi isə coğrafi bir istilah olmaqdan ziyadə qövmi bir məna ilə işlənmişdir. Biz kəndimizi Azərbaycan dili ilə (ki türkcənin bir növüdür) mütəkəllim məxsus bir qövmədd edəriz. Bu qövmün ismi nə Aran, nə Şirvan, nə də Muğandır. Yalnız Azərbaycandır.

Bu təbir, bu məna ilə Rusiya inqilabının Rusiyadakı millətlərə istiqlali-milli verdigindən sonra degil, daha əvvəlcə mövcud idi. Bundan otuz il əvvəl Petroqrad darülfünunlarında təhsil edən Bakı, Gəncə və İrəvan vilayətlərindən gedən müsəlman tələbələr milliyyət əsası üzrə təşkil elədikləri cəmiyyətlərinə "Azərbaycan cəmiyyəti" demişlərdir. Bu ənənə olaraq rus paytaxtında təhsil edən tələbələrimiz "Azərbaycan gecəsi" namilə hər il bir müsamirə tərtib edə gəlmişlərdir.

Qafqasiya türkcəsindən ruscaya bir lüğət tərtib edən əski müəllimlərimizdən Qənizadə cənabları kəza lüğətlərinə "Azərbaycan istilahı" namını vermişlərdir.

Mətləbi kəlmə ilə münaqişə etdirmək doğru olamaz. Çünki məsələ yalnız bir isim üzərinə müncər olursa, o zaman o qədər bir məsələligi də qalmaz. Fəqət qorxulur ki, bu ismin müsəmmasma da hüsni-təvəccöh bəslənilməsin. Ola bilər düşünülsün ki, başqa bir isimlə olsa da məxsus bir qövm olmaq əsası və xüsusiyyəti üzərinə təsis ediləcək cümhuriyyət, İranın şimalında o əsas və xüsusiyyətə uya bilər bir kütlə olduğu üçün mətlub degildir. Böylə bir düşüncənin əlbəttə ki,

ciddi mütəfəkkirlərcə beş para qiyməti olamaz. Çünki o zaman cümhuriyyətimizi təşkil edən qövmin qövmiyyətini inkar etmək, ona kəndi müqəddəratını təyin həqqini verməmək icab edər. Böylə bir vəziyyətə ruslar, ingilislər, firəng və sair xristian millətlər durmadığı halda dindaş bir dövlətin duracağını qətiyyən təsəvvür etməyiz.

Böylə olunca Azərbaycanın nə ismi, nə də cismi iranlı qardaşlarımızda şəkk və şübhə hissi oyatmamalı, yanı başlarında bir Ermənistan, bir Gürcüstan hökuməti təşəkkül etdigi bir zamanda, bir də həmkeş və əqrəba bir Azərbaycan cümhuriyyətinin təşəkkül edib kəsbi-qüvvət etməsini səmimanə bir surətdə arzu etməlidirlər.

Heyəti-mürəxxəsəmizin ən böyük müvəffəqiyyəti iştə bu arzunun İran əfkari-ümumiyyəsində mövcud olduğunu bilmək və bunu bizə bir an əvvəl təbşir etmək olacaqdır.

İntizardayız!

**M.Ə.Rəsulzadə**

*"Azərbaycan", 8 nisan (aprel) 1919, №152*

Mərif – tanışlıq
Tar – güc, zor, tab
Qərabət – yaxınlıq,qohumluq
Tovzi – paylama, paylaşdırma
Ruğən – yağ
Həmkeş – dindaş, məzhəbdaş
Təfəhhüm – dərindən anlama, dərk etmə
Ələni – açıq, aşkar
Məşbu – doymuş, tox
Təbşir – şad xəbər gətirmə
Ələm – bayraq, əlamət, nişan

## Azərbaycan və İran

Tehran qəzetələri cümhuriyyətimiz naminə Tehrana gedən heyəti-mürəxxəsənin vürudini təbrik etməklə bərabər, "İran və biz" məqaləsində bəhs etdigimiz mövzui təcdid edərək "Azərbaycan"ın özündən degil, ismindən uzun-uzadıya bəhs etməgə başlamışlardır.

Başda möhtərəm "İran" qəzetəsi olduğu halda Tehran qəzetələri "Yeni doğmuş islam hökumətinin" adından "dilgir olduqlarını" qeyd ediyor, iki qardaş millətin arasına soyuqluq düşməməsi üçün "Azərbaycan" isminin dəgişməsini təklif ediyorlar.

İran qəzetələrincə bizim, Qafqasiyanın bir qismindən ibarət olan məmləkətimizə Azərbaycan ismi verməgə həqqimiz yoxdur. Bu, İranın minəlqədim vilayəti kibi tanınan Azərbaycan əyalətinin həqqidir.

Biz burada tarix, irq və coğrafiyaca Azərbaycan ismini daşımağa haqlı olub-olmadığımızı isbat və bu münasibətlə

"İran" rəfiqi-möhtərəmimizin adla və istidlalatı həqqindəki mülahizələrimizi bəyan etmədən əvvəl bir mütaliə dərmiyan etmək istəriz:

Biz istərdik İran mətbuatı burasına diqqət etsin ki, Qafqasiyadakı azərbaycanlılar Azərbaycan kəlməsini coğrafi mənasından ziyadə qövmi bir mənada istemal ediyorlar. Dünyada yalnız bir Azərbaycan qitəsi degil, bir də Azərbaycan cəmaəti vardır. Bu cəmaət kəndisinə məxsus bir ləhcə ilə qonuşur türk əqvamından bir millətdir ki, "İran" rəfiqimiz bunlara "ətraki-müsəlmani-Qafqaz" diyor.

"Ətraki-müsəlmani-Qafqaz"ın bir ədəbiyyatı var ki, adına Azərbaycan ədəbiyyatı denilir. Şairləri o dildə, Azərbaycan dilində və yaxud təbiri-mərufilə, şivəsində yazarlar. Məktəblərində o dili tədris edərlər. Mətbuatları o dildə yazılır. Teatrları, operaları o şivədə tərtib edilir.

"Ətraki-müsəlmani-Qafqaz" ilə azərbaycanlı təbirinin eyni mənanı ifadə elədiklərini coğrafiya nöqteyi-nəzərindən cərh eləmək mümkün olsa da, qövmiyyat nöqteyi-nəzərindən bunu inkar etmək mümkün degildir. Zira İrəvan, Gəncə və Bakı quberniyalarındakı "ətrak" ilə Ərdəbil, Marağa, Xalxal, Təbriz və Qaraca Dağ mahallarındakı "ətrak"ın biri-birindən nə ilə ayrıldıqlarını bən iyi fərq edəmiyoram. Eyni lisan, eyni adət, eyni məzhəb, eyni ənənat burada da, orada da hökmfərma, ortada yalnız yüz sənəlik digər bir həyati-siyasiyyə ilə yaşamanın təsiratı mövcud.

"Ətraki-müsəlmani-Qafqaz"ın "ətraki-müsəlmani-İran" kibi daha məruf bir ismi vardır – Azərbaycan türkü.

Əski Şirvan, Muğan, Aran, Bərdə, Albaniya, Bəqrcan, nəhayət, Gəncə, Bakı, İrəvan vilayətləri ilə adlanan bugünki Azərbaycan Cümhuriyyətinin coğrafiya nöqteyi-nəzərindən bu ismə haqlı olduğu inkar olunsa da, burada böyük

bir əksəriyyətlə yaşayan türklərin Azərbaycan türkcəsi ilə mütəkəllim bir millət olduqları cərh olunamaz.

Böyük müharibənin və misilsiz inqilabın nəticəsində zühura gələn növzad hökumətlərin istinad elədikləri ən qüvvətli və ən sağlam bir məbnaları vardır: qövmiyyət binası. Tarix, coğrafiya, strateji mülahizatı ikinci, üçüncü dərəcədə gəlir mülahizələrdir. Yeni bir hökumətin təsis üçün ən əvvəlcə yekvücud bir milliyyət təşkil edən qövmin kəndisini tanımasıdır.

İştə Azərbaycan Cümhuriyyəti Tehran qəzetələrinin düşündügü kibi bir takım "xəyalpərvər" cavanların uydurub "mülahizəsiz" qocalara qəbul etdirdikləri bir ism degildir. Azərbaycan Cümhuriyyəti müstəqil bir həyati-milliyyə ilə yaşamaq istəyən və milliyyətlərini dərk etmiş bulunan Azərbaycan türk millətinin təsis elədigi bir hökumətdir.

Diyorlar ki, "isminizi dəgişin də biz sizi böyük bir qardaş kibi dərağuş" edək. Yoxsa biz sizdən "mükəddər və zəniniz" ("Gülşən", nömrə 85).

Bizdən neçün zənindirlər? Təsəvvür etmək lazım gəlir ki, İranın bir vilayəti olan Azərbaycanın ismini aldığımız kibi müsəmmasına da gözümüz vardır.

Cümhuriyyətimizin, cümhuriyyətdən əvvəl Azərbaycan muxtariyyəti həqqindəki davamızın qətiyyən Araz nəhrinin cənubuna aid olmadığını dəfələrlə söyləmiş, bilfel dəxi isbat eləmişiz. Buna qarşı: "vəqtilə ermənilər dəxi məqsədimiz Türkiyə Ermənistanıdır diyorlardı" – deyə şübhələr bəyan ediyorlar ("İran", nömrə 414). Bu misal, yəni Azərbaycan Cümhuriyyətinin İran Azərbaycanı ilə işi olmadığı həqqindəki bəyanatı ermənilərin Ermənistan həqqindəki bəyanları ilə müqayisə eləmək bizi ismdən ziyadə müsəmma üstündə dayanmaya vadar ediyor.

Əcəba, nə düşünüyorlar? İranlı qardaşlarımız necə təsəvvür ediyorlar? Arazın şimalında, ismindən sərfi-nəzər, bir müsəlman cümhuriyyəti təşəkkül ediyor. Bu cümhuriyyətin lisanı Arazın iki tərəfində də konuşulan bir türkcə olacaq. Hakimiyyəti "İran"ın təbirincə deyəlim, "ətraki-müsəlmani-Qafqaz"ın mənus olduğu ruh və ənənatdan, ülfət etdigi adat və məişətdən doğma bir ruh və xüsusiyyətlə qüvvətlənəcək, ismini bir fərz, qəribə olsa da Qafqaz türk hökuməti qoyacaq. Əcəba, bunda İran üçün bir xətər, bir zərər təsəvvür olunuyormu?

Əgər İran hökuməti Avropa mətbuatından anlaşıldığı vəchlə Zaqafqasiya hesabına tovsi-ərazi etmək fikrində degilsə, bittəbii burada kəndisindən ötrü xətərnak bir şey təsəvvür olunamaz. Çünki yeni təşəkkül edən hökumətin kəndisinə qarşı mütəcaviz olmadığını bildikcə, buna yalnız müsaidət etməsi lazım gəlir. Yox, bu xüsusda etimadı yoxsa, o zaman ismin bu və yaxud başqa olduğunun əhəmiyyəti qalmaz. Zira göstərdigi misalda olduğu kibi bugünki Ermənistan Cümhuriyyəti adına bərfərz "Ararat" deməklə Türkiyə ərazisi üzərindəki müddəiyatından sərfi-nəzər etmədi, yaxud Türkiyə ərazisi üzərində Ermənistan ismi ilə degil, bir fərzi "Van" ismi ilə təsis etsəydi, madam ki, Qarabağa qədər tovsi etmək fikrindədir, kəndisinə Ermənistan deməməklə bundan fərağət etməyəcəkdi.

Bilməyiz təkəddür yalnız İranın bir vilayəti ilə iltibas edən ismimizdənmi, yoxsa İran Azərbaycanındakı xəlqin mənəviyyatına təmas edən bir müsəmmamızdanmı iləri gəliyor?

Məsələ yalnız ismə aid olsaydı o qədər əhəmiyyəti olmazdı. İsm üstündə beynəldüvəl bir ixtilaf zühuri tarixi-aləmdə görülməmiş, islam tarixində dəxi inşallah görülməz.

Bizə öylə gəliyor ki, Araz nəhri şimalında olan azərbaycanlıların təşkil elədikləri müstəqil bir hökuməti-islamiyyənin paydar olması İranın mənafeindəndir.

Əgər Parisdəki İran heyəti-mürəxxəsəsinin Zaqafqasiyadan yer almaq istədigi həqqindəki nəşriyyat doğru isə, o zaman həqqimiz var düşünəlim ki, İran hökuməti bizim kibi degil, başqa dürlü düşünüyor. Çünki "İran" qəzetəsinin də işarə elədigi kibi vəqtilə İrandan kəsilən Azərbaycanı təkrar İrana "yəni Azərbaycana" bitişdirərlərsə, o zaman yerdə – sərih söyləmək lazım gəlirsə – bir Şamaxı ilə Şirvan qalır ki, Dağıstanla bərabər qalmaqdan başqa çarəsi qalmaz.

Heyəti-mürəxxəsəmizin vürudini təbrik edən Tehran mətbuatı o zamandan bəri bir-iki-üç sətirlə iktifa etmiş ikən adımızdan hasil elədikləri təkəddürlərinin izahı üçün sütunlar degil, səhifələr dolusu yazılar yazmaya lüzum gördüklərindən bizdə böylə şübhənak bir hiss oyatmışlardır.

Möhtərəm "İran" qəzetəsi "Azərbaycan" isminin və bu müsəmmadan qəsd olunan Azərbaycan məqsəd və fikrinin müvərrici olaraq acizlərindən bəhs edərkən əvvəldə Qafqasiya Azərbaycanından bəhs etmişkən sonra bütün Azərbaycan üçün istiqlal istədigini qeyd ediyorlar. Fəqət bilməm ki, bunu hanki bəyanım və hanki bəyannaməmlə izhar eləmiş, nə vəqt və nə yerdə söyləmişəmdir?! Hələ Azərbaycana müqabil əvəz olaraq İrana Mərv və Türkistandan təzminati-əraziyyə təklifində bulunanlarımızdan dəxi bəhs olunuyor ki, əcayib bir şeydir.

İştə iranlı qardaşlarımızın bu kibi yanlış və bir takım iğraqlara batmış məlumatdan istifadə etdikləri üçündür ki, onlar Azərbaycan isminə bu qədər əhəmiyyət verib nahaq şübhələrə və münasibətsiz gümanlara düşüyorlar.

Buradan keçdikdən sonra Azərbaycan kəlməsi üstündəki tədqiqata gələlim: müqəddəmatən söylədik, bizdən ötrü kəlmənin coğrafi mənasından ziyadə qövmi bir mənası vardır. Məəmafiə bir az tədqiq olunursa coğrafiyaca dəxi Azərbaycanın mütləqa Təbriz və həvalisindən ibarət olduğunu iddia etmək pək doğru olamaz.

Azərbaycanın İrana daxil olduğunu istidlal üçün Şəmsəddin Sami bəyin Qamusu iləlarus kibi lüğət kitablarına müraciət olunmuş, Yaqut Həməvi və sairə kibi coğrafiyun və müvərrixlərin asarından alınan iqtibaslarla Azərbaycanın ayrı, Qafqasın da ayrı olduğu isbat edilmişdir. Şirvan ilə Bərdənin dəxi Azərbaycandan qeyri olması ayrıca istidlal olunmuşdur.

Bundan 24 sənə əvvəl yazdığı Qamusi-illaəlamində Şəmsəddin Sami bəy mərhum Azərbaycanın İran daxilində olduğunu qeyd etməklə bərabər Azərbaycan isminin vəchitəsmiyəsini dəxi anlatmışdır. Bu anladışa görə Azərbaycan ismi Təbriz ətrafındakı neft quyuları, hava qazları və təbii atəş ilə yanan atəşgədələrdən dolayı bu məmləkətə ələm olmuşdur. Fəqət bir Osmanlı mühərriri yanılsa da iranlılar bilərlər ki, Azərbaycan təsmiyyəsinin vəchi olaraq göstərilən əlamətlərin həpsi Təbrizdə degil, Bakıdadır.

Bir takım türk sülalələrinin paytaxtı Təbriz olmaq üzrə Azərbaycanda hökmran olduqları iddia ediliyor. Fəqət bununla Azərbaycan isminin yalnız Təbriz ilə həvalisinə münhəsir olduğu istidlal edilməz ki.

Qafqas ismi ilə Azərbaycan ismlərinin ayrı olduğu və bu ayrı ismlərin ayrı-ayrı məmləkətlər adı olduğunda heç şübhə yoxdur. Fəqət dün rus dövlətinin təqsimati-idarisilə Qafqas və yaxud Zaqafqasiya adlanan ərazinin Bakı, Gəncə, İrəvan kibi adlarla təqsim olunuşu İrəvan, Gəncə və Bakı vilayətlərindən bir qisminin Azərbaycan olmadığını icab

etdirməz. Məsəla, eyni Şəmsəddin Sami bəy Gəncənin yaxınında olan "Şəmkir"i tərif edərkən diyor ki, "240 tarixində Azərbaycan valisi və Məsmək Azadlisi (Bəğa) tərəfindən emar olunub mütəvəkkilliyə təsmiyə olunmuşdur".

Deməк ki, Azərbaycandan qeyri-fərz olunan Gəncə quberniyası və daha qədim təbirlə Aran ilə Bərdə həvalisi dəxi Azərbaycan vilayəti daxilində imiş.

Qafqaz ismi ələm olub da müxtəlif nəvahi və vilayətlərə şamil olduğu kibi, Azərbaycan ismi də Qaradağ, Xalxal, Marağa, Muğan, Aran, Bərdə, İrəvan, Naxçıvan, Bakı və sairə kibi idari, tarixi və coğrafi ismləri ehtiva edə bilər.

Burada cüzin küll namını ala bilmədigi həqqindəki mülahizə və bu mülahizəyə qiyas olaraq Bismark ilə Avstriya arasındakı münaqişədən istidlal dəxi doğru degildir.

Çünki biz azərbaycanlı türklərin hökumətini təşkil etmək mövqeində ikən İrana Azərbaycan ismindən fərağət et, desə idik, o zaman həqsiz olurduq. Müxtəlif millətlərdən təşəkkül elədigi halda İran Azərbaycana malik olduğu kibi, Avstriya da alman millətinə malik idi. Halbuki Avstriyanın almanlara malikiyyəti Almaniya hökumətinin təşkilinə mane olamaz və hələ bütün Almaniyaya hakimiyyət sövdasına düşmək üçün kəndisinə heç bir həqq verəməz idi. Bismark bu nöqteyi-nəzərdən pək həqli idi.

Bitərəfanə icra olunan müxtəsər bir tədqiqlə görülür ki, Azərbaycan ismi cümhuriyyətimizə İran qəzetələrinin düşündügü kibi pək münasibətsiz bir "xam xəyal" nəticəsi olaraq verilməmişdir. Burada İran ərazisi həqqində heç bir suyiniyyət mövcud olmayıb, yalnız bu gün kəndisini bir millət olaraq bilən sabiq rus təbəələri – Azərbaycan türklərinin müqəddəratı düşünülmüşdür. Böylə ikən yeni təşəkkül edən bəzi – Polşa, Ukrayna kibi dövlətlərə qiyasən bizi də macə-

racuyanə bir siyasət təqibi ilə məlul təsəvvür etmək doğru olamaz.

Madam ki, yeni bir hökuməti-islamiyyənin vücudi İranca da mətlubdur, o halda tehranlı rəfiqlərimiz ism üzərindəki mübahisəyi coğrafiya və qövmiyyət mütəxəssislərinə buraxıb da müsəmmadan bəhs etsəydilər, aramızda mətlub olan hüsni-münasibatə daha ziyadə xidmət edərlərdi, zənn edəriz.

"İran" qəzetəsi Gürcüstan, Ermənistan hökumətləri ilə hüdud münaziələrimiz mövcud olduğunu və sair bir çox əsaslı müşkilatə məruz qala bilməmizi ixtar edərək cümhuriyyətimizin böyük qardaşı olan İranla hüsni-münasibatın son dərəcədə səmimiləşdirilməsini arzu ediyor. Öylə olursa, o zaman iranilər bizə hər növ maddi və mənəvi müsaidələrini vəd ediyorlar.

"İran" bir az da tarixə müraciət ediyor. Böyük Nadirin İran padşahı olaraq Türkiyə Sultanına ittihad həqqindəki təklifini xatırlıyor. O təklifin qəbul edilmədiyi üçün bugünki İslam aləminin xəsarətinə, bilxassə Türkiyə fəlakəti-hazirəsinə təəssüfi-xəvan oluyor. Sonra da "nəşəyi-hürriyyət"lə sərşar olan "Ətraki-müsəlmani-Qafqaz" cavanlarından bir-ikisinin "xam xəyallarına" uymamayı heyəti-mürəxxəsə əzamızın əql və dərayətlərinə etimadən "xatiri-nişan" ediyor.

Görünüyor "təkəddür" yalnız "Azərbaycan" ismindən degildir. "Nəşəyi-hürriyyətlə sərşar olan cavanlar"ın "xam xəyallarından" da əndişələr edilməkdə və həm bu xəyallar mövcud kibi görülməkdədir.

Biz buna ciddən mütəəssüfüz. Nadir şahın fikri-ittihadını zənn edirsəm "Nadir şah" əsrini təmsil edən azərbaycanlılar yalnız tərvic degil, tətbiq də etmişlərdir. Yalnız oğlunun gözü müqabilində çıxaracağı batmanlarla göz təhdidi ilə degil, eyni zamanda da məəttəəssüb və dar mollalara qarşı işlətdiyi

siyasətə qurban olan Nadirin fikrini – məzhəb qovğalarının ortadan qaldırılmasını – qövldən-felə gətirənlər yenə "Ətraki-müsəlmani-Qafqaz"dır.

Fəqət unutmamalıyıq ki, Nadir şah kibi Sultan Süleyman da ittihad güdüyordu. Birisi bunun üçün məzhəbləri ortadan qaldırıb da siyasi bir hakimiyyət təsisini lazım görür ikən, digəri "rafiziləri" tənkil ilə "həqqə" təslim etdirmək və bu vasitə ilə "tovhidi" əldə etmək istiyordu. Felən ikisi də cahangir ikən şübhəsiz ki, əvvəlinci nəzəriyyə daha doğru olub, ittihadə yetişmək üçün daha səlim vasitədir.

Fəqət bu dəsturi məzhəb dövründən çıxıb da milliyyyət əsrinə girmiş olduğumuz bu zəmanə tətbiq edərsək, rabitəyi-islamiyyəyi ibqa etməklə bərabər hüquqi-milliyyəyə ehtiramkar olmalı, bu xüsusdakı təaliati-təbiiyyəyə fəna bir nəzərlə baxmamalıyız.

Zəmanımızda demokratik əsaslara istinad etməyən bir hökumət yaşayamaz. Xəlq lisanı, adatı, ənənatı ilə mənus və məluf olmayan bir hökumət isə demokrat olamaz.

Buna görə dəxi tamamilə milli və demokrat bir əsasat üzərinə təşəkkül edən cümhuriyyətimizə iranlı qardaşlarımız kəndi münasibətlərini təyin edərkən ismimiz samiələrinə xoş gəlmiyorsa da, müsəmmamıza baxsınlar. Müsəmmamızı məqbul və kəndi nöqteyi-nəzərlərindən mətlub gördükdən sonra ismin o qədər əhəmiyyətə malik olmadığını kəndiləri də təqdir edərlər.

Biz böyük qardaş iddiai mühitində bulunan Tehran mətbuatından şəkildən ziyadə mənaya aid nəşriyyata intizar edəriz. Çünki zəvahirlə fəzlə məşğul olmaq hər halda böyüklərin şüunundan olmaz, deyə düşünüyoruz.

**M.Ə.Rəsulzadə**

*"Azərbaycan", 28 nisan (aprel) 1919, №168*

Təcəddüd – təzələmə, yenilətmə
Məruf – məlum, tanınan
Ətrak – türklər
Mütəkəllim – danışan
Cərh – sancma, yaralama
Zənin – şübhəli, etibarsız
Müsəmma – adlandırılan ərazi
Sərfi-nəzər – vaz keçmə
Ülfət – yekdillik, hüsn-rəğbət
Tovsi – genişləndirmə
Müsaidə – izn, icazə, yardım
İltibas – dolaşıqlıq, aydın olmama
İğraq – mübaliğə
Məamafiə – bununla belə
Həvali – ətraf, civar
Müddəiyat – haqsız iddialar
Ələm – nişan, işarə, əlamət
Mütəvəkkil – bel bağlayan, ümid verən
Nəvahi – nahiyə, vilayət
Məlul – kədərli
Rafizi – rafizə təriqətinə mənsub, inkar edən, kafir
Tənkil – başqalarına ibrət olacaq cəza vermək
Mənsus – alışmış, öyrənmiş
Təkəddür – burada, rahatsızlıq
Münaziə – mübahisə
Fərağət – vaz keçmə, əl çəkmə
Məluf – yemlənmiş
Samiə – eşitmə duyğusu
Şüun – şan-şöhrətlər
İstidlal – bir dəlilə əsaslanaraq nəticə çıxarmaq

## İran – Azərbaycan

Bu mövzuda qəzetəmiz ilə Tehran mətbuatından möhtərəm "İran" qəzetəsi arasında bir münaqişə vaqe olduğunu qarelərimiz biliyorlar. İran qəzetəsi cümhuriyyətimizə Azərbaycan ismi vermək həqqində olmadığımızı, biz isək bunun əksini isbat ediyorduq. "İran" qəzetəsinin tərəfimdən yazılan son məqaləsinə cavab yazmaq üzrə ikən posta məzkur qəzetənin 454-cü nömrəsini gətirdi. Bu nömrədə "Qəzavat tarixi" ünvanı ilə İsmayıl Əfşar Tarəmi-Azərbaycanı imzasilə müfəssəl bir məqalə nəşr ediyor. "Elmi intiqad və azadi mətbuat" naminə dərci təqaza olunan bu məqalə Bakı ilə Tehran arasında olan mübahisəyə iştirak edərək kəndisi iranlı ikən həqqin biz tərəfdə olduğunu tarixi və elmi bir surətdə isbat ediyor. Bu müfəssəl məqaləyi tərcümə ilə aşağıya dərc ediyoruz:

***

İştə "İran" qəzetəsində mündəric məqalənin eynən tərcüməsi: 439 və 440 nömrələrinizdə ədibi-maarifpərvər M.Ə.Rəsulzadə əfəndinin qələmi ilə yazılmış Azərbaycan həqqində bir məqalə dərc edilmişdir. İran qəzetəsi dəxi haman məqalənin zeylində bəzi mətləbləri tənqid eləmişdi. Bu münaqişəyə bən də iştirak etmək istədim. Fəqət bu iştirakımla bən Azərbaycan hökumətinin İran üzərində siyasi təsiratından sərfi-nəzər yalnız bir həqiqəti-tarixiyyənin kəşfi üçün səy edəcəyəm. Çünki məşhur müvərrixlərdən Qustel Dokulanır der ki, tarixi ehsasati-vətəniyyə ilə qarışdırmaq hər zaman möhlikdir. Onlardan birisi elm, digəri isə fəzilətdir.

Şərq və Qərb müvərrixləri ilə coğrafiyunlarının rəylərinə görə Azərbaycan Zaqafqasiyanın qismi-şərqisindən, İrəvan, Naxçıvan və bütün İran Azərbaycanı, bütün Xəmsə vilayətləri, Tarəm, Talış, Gilan həvalisindən bir qismi ilə Həmədan və Qəzvindən ibarət olmuşdur. Rzaqulu xan Lələbaşı ki, rus-İran müharibəsinin müasirlərindəndir, Rövzeyi-Lisfanın 10-cu cildində diyor ki:

Azərbaycan keçmiş zamanlarda Bakı bəndərindən Xalxalə qədər tula 95 fərsinin və Macirvan qəsəbəsindən Cəbəli-Sinayə qədər ərza 55 fərsinin bir məsahədə vaqe olmuşdur. Eyni məzmunda təfsilat Büstanülsiyahə ilə digər əsərlərdə dəxi məzkur ki, mətləb uzanmasın deyə zikrindən sərfi-nəzər ediyoruz[1]. Bu həqiqəti-tarixiyyə kəşf olunursa, İran qəzetəsinin vətənlərinin əski nami-müqəddəsini ehya etmələri üçün azərbaycanlıları həqli görəcəgini ümid edərim.

---

[1] Bu xüsusda şübhələri olanlar İstaxiri, Müqəddəs, Yaqut, Əbuülqəda, Sədulla, Hafiz, Kitabi-Cəlaliyə rücu buyursunlar.

Əxlaq, adat və dil barəsində də dəxi bir takım şeylər zikr edilmişdi. Bunun doğru olduğunu dəxi isbatə lüzum yoxdur. Zira Qəzvindən birisi qalxıb da Qubaya müsafirət eləsə yalnız əxlaq, adat və dil birligində degil, şivə və ləhcənin dəxi eynilə bir olduğunu görər. Bu gün bir tehranlı ilə bir şümranlı ləhcələri arasında fərq vardır. Mazandaranlı ilə dəvmandlının şivələrindəki fərq isə daha bəllidir. Bu böylə ikən aya, azərbaycanlıların bir cinsdən və bir irqdən olmadıqlarını iddia etmək qabilmidir?

Şimdi görəlim, Amerika və İngiltərənin bitərəf üləması bu xüsusda nə diyorlar.

Professor Nikela Qrabils diyor ki: 1907-ci ildə Amerika asari-ətiqə mütəxəssislərindən bir heyət Azərbaycanı tədqiq üçün getmiş idi. Bu heyət kəndi məruzəsində diyor ki:

"Türküstan ilə Kürdüstan arasında Azərbaycan mahallarında çini və zürüfat kibi qədim türk asari-ətiqəsinə təsadüf edildi. Hətta bəzi sikkə və kətəbələr üzərində uyğurca yazılar vardı". (Uyğur əski Azərbaycan hökumətinin rəsmi lisanı olmuşdur).

Eyni professor ingilis üləmasının əsərlərindən birisindən nəql ediyor ki:

Turan həqqindəki tədqiqat getdikcə genişləniyor, Asiyayi-vüstanın hər tərəfində bu millətin əsərlərinə təsadüf olunuyor. Burası bizcə mühəqqəqdir ki, İranın ətrafı türklərlə mühat olub qədim iranilərin (arini-qədim) ilk müharibəsi Azərbaycan türkləri ilə vaqe olmuşdur.

Məzkur professor diyor ki, türklərin iranilərdən daha əvvəl Azərbaycanda sakin olduqları adla və bir ahin ilə sabitdir. Professor Nikela Qrabilsin təlif elədigi "Məsələyi-şərqiyyə" nam kitabında (61-64-cü səhifələr) ariyənlərin

Azərbaycandakı ərzi və ati olduğu həqqində bir çox sübut və dəlillər vardır və Azərbaycan həmişə türklərin olmuşdur. Bunu tarix asanlıqla isbat edər.

Tarixi-qədimdən əldə mövcud olan nə varsa yunanlılardan nəql olunmadır. Tövrat ilə bəzi ortadan itmiş İran və hind asarından sərfi-nəzər yunanlılar müfrit bir təəssübi-milliyyə bəslədiklərindən və şərqi-qədim lisani-tarixiyyəsinin ədəmi-müsaidəsindən dolayı tarixi bir çox əfsanələr və yalanlarla doldurdular.

19-cu əsrə qədər tarixi-qədim həqqində yunan asarından başqa əldə bir vəsiqə yoxdur. 19-cu əsrin tülüində bir çox ingilis, firəng və alman üləmasının himməti ilə keçmişin ölü dilləri həll olunaraq bu vasitə ilə asari-qədimədən mövcud olmayan bir çox tarixi həqiqətlər açılmış oldu. Kətəbələr kəndisinə heç bir əl sürülmədən samit və sabit bir halda qədim dövrlərin sərgüzəştini bizə nəql ediyorlar.

Avropa üləması kəşf olunan bu kətəbələr sayəsində bilmişlər ki, Kildə və Assur dövlətlərinin təşkilindən əvvəl və aryanilərin qərbə doğru olan hərəkətlərindən daha müqəddəm Orta Asiyada digər millətlər sakin olmuşlardır. O millətlərin dilləri tədqiq olunduqda türk cinsinə mənsub olduqları və bu günlər türklərlə həmcins olduqları aşkar oluyor. Bu millətlərdən akkad-sumer denilən bir qismi Beynəlnəhrində, hitlər Anadoluda, uradhular Azərbaycanda mütəvvətən olmuşlar. Kilikiya, Beynəlnəhrin və Azərbaycanda bir çox kətəbələr bulunmuşdur ki, üləma onlardan bəzisini oxuya bilmişlərdir.

Bu kətəbələrdən sabit olmuşdur ki, məzkur millətlər böyük bir mədəniyyətə malik olmuşlar. Vəqta tarixi müəyyən olmayan bir zamanda övladi-sam cəzirətüləərəb akkadsumerə həmlə edib onlarla ixtilat edərək Hammurabi-Ak-

kad mədəniyyətinin əsasını vəz etdilər. O zamanlarda ariya millətləri şərqdən hücum edərək nagəhani bir istila nəticəsində urarduhu və heyət millətlərini məhv edərək ermənilər Azərbaycanda, frakiyalılar da Anadoluda sakin oldular. Oksford darülfünununun aliqədr professorlarından Says diyor ki:

"Turanilər bu böyük mədəniyyətin əsasını vəz etdilər, məqsəd növi-bəşərin mədəniyyət övliyasıdır ki, əgər iranilər onu məhv etməsəydilər bizə ondan böyük yadigarlar qalacaqdı. Fəqət İran istilası bu təməddünü məhv elədi. İranilər ancaq kəndi məmləkətlərində bir əsəri-təməddün göstərə bildilər. Yoxsa mütəvaliyən icra olunan hərblər nəticəsində müştərək bir Urarduhu-İran mədəniyyətini vücudə gətirəmədilər[1].

Üləmanın bəzisinin əqidəsi bu mərkəzdədir ki, kürd, gürcü, talış urarduhu nəslindəndirlər. Urarduhu ləfzi ilə kürd ləfzi arasında şəbahəti-tammə vardır. Bu millətlər kəndi istiqlaliyyətlərini qeyb etdikdən sonra İran mədəniyyətinin qarşısında duramayıb məhv olmuşlar. Sitlər daima Azərbaycanı fəth eləmək qəsdində olmuş, yeni təərrüzlərdə bulunmuşlar. Onlardan bir qismi Azərbaycana daxil olub İran din və əxlaqını qəbul eləmişlərdir.

Bu mütaliədən məlum oluyor Turan millətləri mütəməddin idilər və Avropanın məruf üləmasının dediginə görə Babil mədəniyyəti Turan mədəniyyətinin bir surəti-mütəkamili idi. Böylə ikən "İran" qəzetəsinin bu üstə-vürudi moğol – deyə yazması mucibi-heyrətdir. Görünüyor ki, qəzetə bu xüsusda Mətinülsəltənəyə nəzirə yapmışdır. Mərhum Mətinülsəltənə qeyrətinin şiddətindən xuddarlıq edəməyib vəhşi türklər islamı məhv və nabud etdilər – deyə yazmışdı.

---

[1] Turanın qədim təməddüni həqqində aşağıdakı kitablara müraciət oluna

Halbuki münsiflər təsdiq etdilər ki, türk millətinin islama olan xidməti heç bir zaman unudulmaz. Türklərin səlibiyyunə qarşı müdafiəsi, Təbristanı islavlardan təmizləmələri (6-cı əsr Kamil cild, 11 və 12) (Batu) bu xüsusdakı qəhrəmanlıqları ki, onun sayəsində islavlar bir boyuna 5 yüz sənə artıq hərəkət edəməz oldular. İslam hüdudunun Kiyev, Varşu, Krakov, hətta Vyana hasarlarına qədər dayanması və səkkiz milyon hindlilərin müsəlman edilməsi ki, bu gün dəxi onlar müsəlman aləmi həqqindəki dad və fəryadlarının nə dərəcədə müəssir olduğunu görüyoruz, əcəba, bunlar türklərin xidməti degilmidir? Oğuz, Tümən, Atilla, Çingiz, Teymur, Fatih-Səlim, Süleyman, Nadir, Ağa Məhəmməd xan kibi sərdarlar, Çingizin yasası, Teymurun tüzükü kibi qanunlar, səlimlər qanununun əsəri əcəba unudulurmu?

* * *

Ərəb istilasından sonra Azərbaycan; ərəblərin istilası zamanında Azərbaycandakı türklər sutublarla urarduhu bəqasından ibarət idilər. İran məzhəbi ilə adat və əxlaqi onlara nüfuz eləmiş idi. Rəşid və Mamun zamanlarında iranilər xüləfa dərbarında böyük nüfuz qazandılar. Bu nüfuz bir dərəcəyə qədər iləriləmişdi ki, əgər Mötəsim tədbir görməsə bütün ərəb hökumətinin iranilərə intiqal etmək qorxusu vardı. Türklərdən ibarət məxsusi bir qoşun təşkil edərək bu vasitə ilə Mötəsim farsların nüfuzunu kəsr eləmişdi. Fəqət ərəblər bundan müstəfid olamıyaraq aralarına əvvəlkindən daha ziyadə bir ixtilal düşdü. Bir dərəcədə ki, türklər istəmədikləri xəlifəni əzl ediyor, yerinə istədiklərini nəsb eliyorlardı. Buna görə də xüləfa məcbur oldular ki, türk qoşununu paytaxtdan uzaqlaşdırıb sərhədlərə göndərsinlər. Bunlardan bir qismini islav-

qıpçaq qabağını saxlamağa göndərdilər. Bunlardan bir qismi Azərbaycanda qalaraq Xistənyan və sairə kibi Azərbaycan hökumətini təşkil etdilər, o zamanlarda səlcuqilər Xorasandan gəlib Azərbaycanı tutdular. Azərbaycan bu sülaləyə intiqal elədi. Səlcuqilərin intiqrazmda səlcuq şiələrindən olan Atabəylər Azərbaycanda səltənət etdilər. Ülfi və Kamil tarixlərindən məlum oluyor ki, Atabəylər zamanında türk xanəvadələrindən bir çoxu Türkistandan Azərbaycana gəlib burada sakin olmuşlardır. Qıpçaq səfərində bu müsəlman olmuş türklərdən bir çoxu ərəb ordusunda idi. Fəqət məlum idi ki, Azərbaycan düşmənləri bulunan ermənilərlə debilməlilərə qarşı müqavimət edəmiyəcəkdi. Bu sıralarda idi ki, Azərbaycan yarlığı Qaani-əzim tərəfindən Hülaküyə vagüzar olundu. Hülakü müxtəlif türk qəbiləsindən 32-ni ayıraraq Bağdad ilə Azərbaycan səmtinə rəvanə qıldı. Bütün Turanda zəfər təranələri çalındı. Car çəkildi ki, Purçəkin xanəvadəsinın ən şücaətli bir cavanı Qərbi Turanı mühafizə eləməgə gediyor. Elxani-əzim Bağdaddan Azərbaycana gəldi. Türk qəbilələrindən ötrü qışlaq və yaylaqlar təyin elədi. Bu günlər Azərbaycan milləti təşkilatınm ovci-əlaya yetişdigi günlərdi. Elxan Marağada ikən dari-əqbayə rəhlət etdi. Nəvələri Qazan xan ilə İlcaytu Azərbaycan millətinin rüknini möhkəmlədərək onu dini-islamla qüvvətləndirdilər. Xacə Rəşidəddinin yazdığına görə bir dəfə 200.000, digər dəfə 400.000 türk islama müşərrəf oldu. İslavların (rusların), ermənilərin, gürcülərin, sonra da Cəbə və Səvidi nam cəngavərlərin istilası ilə hasil olan qətliamlar vasitəsilə Azərbaycanın farsları məhv olmuşlardı. O gündən bu günə qədər bir ovuc ermənidən savayı bütün Azərbaycan əhalisi türk və müsəlmandır. Sultan İlcaytu Azərbaycanda bir takım təcəddüdlər vacudə gətirdi. O cümlədən olaraq Azərbaycan paytaxtını Marağadan Sol-

taniyyəyə köçürtdü. Məəttəəssüf ki, sindibad həvadisə qarşı bu bina davam edəməyib məhv oldu.

Bu gün Azərbaycanın o böyük o paytaxtından bir məzari-qübbə qalmışdır. Bu qübbə illərin təsirinə müqavimət edərək qalmışsa, ixlafın naxələfligi üzündən o əsər dəxi xərabəyə üz tutmaqdadır. Hər sübh günəş o qübbə üzərinə tülu edərək inikasatı ilə bizə türk millətinin fütuhat və iftixaratını yad etdiriyor. Azərbaycan Elxanian sülaləsinin inqrazından sonra Çobanian sülaləsinə intiqal ediyor. Bunlar Azərbaycanı idarədən aciz qaldıqlarından qəbilələrdən bir çoxu babalarının qədim yolunu tutaraq Anadoluya köçüyorlar. Teymurun zühuri və Anqara vaqeəsindən sonra bu qəbilələrdən bir çoxu təkrar Azərbaycana ovdət ediyorlar. Bədə Şeyx Səfinin irşadati ilə şiə məzhəbi qəbul edib, Anadoludakı qardaşlarını da bu məzhəbə daxil etdiriyorlar.

Şah İsmayılın zühurundan sonra Anadoludakı azərbaycanlılar Şah Abbasa köməgə gəliyorlar. Fəqət Osmanlı hökuməti bunlara mane olduğundan bir qismi Anadoluda qalıyorlar (bu gün Osmanlı azərbaycanlıları Amasiya və Anqara vilayətlərində 500.000 miqdarında olub kəndilərinə qızılbaş denilməkdədir). Elxan sülaləsinin inqirazından sonra sonra Şah İsmayıl əfşar qəbiləsini Xəmsə, Marağa, Qarabağ və Şirvan vilayətlərinə, qacar qəbiləsini də Səlmas, Gəncə və İrəvana məmur elədi.

Şah İsmayıl zamanında Azərbaycan ədəbiyyatı rəvac eləmişdir. Təqribən demək olar ki, Şah İsmayıl Azərbaycan ədəbiyyatının binasını vəz eləmiş və kəndi Divani-türkisini yadigar olaraq buraxmışdır. O zamanın böyük şüərası Azərbaycan türkcəsinin ehyasına çalışmışlardır. Füzuli, Məsib xan, Təkəllü Sani, Təkəllü Sadiq Əfşar, Həsən Türkman və Yusif Qarabaği o zamanın türkcə yazar şairləridir. (Təzkirə Sa-

diq ilə Təxfeyi-Samiyə rücu oluna). Azərbaycanlılar səfəviyyə və əfşariyyə və onlardan sonra zamanında kəndi ədəbi-siyasi təşkilatlarını quruyordular. Bu zamanda rus militarizmi həmlə edərək Azərbaycanın bir qitəsini digərindən ayırdı, möhtərəm şəhid Cavad xan ilə İbrahimxəlil xan, Mirhəsən xan və sair bu kibi qəhrəmanların rəşadət və müqaviməti istilanı qurtara bilmədi. Azərbaycanın qismi-şimalı yüz sənədən ziyadə rus əsarətində qaldı, tainki hürriyyətin sədayi-fərhəfzası üfiqi-ələmdə tərənnümsaz olub Rusiya militarizmi elani-iflas elədi, bunun üzərinə Azərbaycan məmləkəti təkrar qəddini düzəldərək təmami-aləmə elani-istiqlal etdi. Bu üçüncü dövrədir ki, azəri türkləri kəndi azadlıqlarının binasını qurmaq üçün və azadlıq düşməni olan Azərbaycan düşmənlərinin dəfi üçün mübarizə ediyorlar. Əlbəttə ki, edəcəklər və kəndi cavanlarının fədakarlığı sayəsində Azərbaycan istiqlalını paydar etməklə müzəffər olacaqlardır.

Azərbaycanlı qardaşımızın tərcüməsi, yuxarıda məzkur bu məqaləsinə "İran" qəzetəsi uzun-uzadıya cavab veriyor. Bittəbii onun dəlil və sübutları ilə müvafiqət edəmiyor. Bu xüsusda ayrı bir vəqt.

**M.Ə.Rəsulzadə**

***"Azərbaycan", 26 həziran (iyun) 1919, №212***

Qəzavat – dini məhkəmə, qazılıq
Tarəm – ən yüksək
Təqaza – lazım gəlmə, tələb, lüzum
Məhlikə – qorxulu, təhlükəli
Fəzilət – bilik
Züruf – qablar

Çini – Çində düzəlmiş, əla növ saxsı qab-qacaq
Kətəbə – kitab, lövhə
Mühat – əhatə olunmuş
Təlif – yazılmış kitab, əsər
Ərəzi – əsli olmayıb sonradan əmələ gələn
Ati – ön, qabaq
Mütəvvətin – bir yeri özünə vətən edən, bir yerdə yaşayan
Aliqədr – yüksək dərəcəli, hörmətli
Mütəvali – mütəmadi
Şəbahət – oxşarlıq, bənzərlik
Müəssir – təsirli
Kəsr – sındırma, qırma
Müstəfid – faydalanan, istifadə edən
İntiqal – keçmə, nəql etmə
Xanəvadə – nəsil, say
Rəhlət – köç, hərəkət, məcazi: ölüm
İnqiraz – sonu kəsilmə, məhv olma

## Azərbaycan Cümhuriyyəti

Coğrafiya etibarilə Azərbaycan isminin yalnız İran vilayətlərindən Təbriz ilə həvalisinə ələm olduğu məruf olsa da bu ismin tarixcə dəxi yalnız bu vilayətə münhəsir olduğu sabit olmuş həqiqətlərdən degildir; biləks bu ismin Azəri türklərlə məskun bütün yerlərə şamil bir ism olduğuna dəlil və sübutlar vardır.

Bu xüsusda isbati-müddəa etmək üçün səhifələr yazmaq mümkün ikən biz cümhuriyyətimizə verdigimiz adı coğrafi bir məfhumdan ziyadə qövmi bir mənadan aldığımız üçün bu məsələ ilə pək o qədər də məşğul olmaya lüzum görmüyoruz.

Müştərək bir dil, yazı, ədəbiyyat, adat, ənənat və tarixə malik olmaq bir millət amallarını təşkil edərsə heç şübhəsiz ki, Araz nəhrinin iki tərəfində sakin; cənubda Təbriz, şimalda Bakı məntəqəsində toplanan xəlqin əksərini bir milləti-

vahidənin namizədidir. Yuxarıda məzkur amillərin vücudu ilə bərabər bir cəmiyyət əfradının kəndi birliklərini hiss və idrak eləmələri, sözün tam mənasilə milli bir vücuda dəlalət edərsə, heç şübhəsiz ki, bu milləti-vahidə namizədinin Arazın şimalındakı qismi kəndisini bilmiş bir millətdir.

Bu, əsrimizdəki tərifati-elmiyyəsi ilə qismən millət olmağa namizəd və qismən də bir millət olmuş xəlqin məruf bir ismi vardır:

– Azərbaycan türki və yaxud Azəri türklər.

Kəndi şiveyi-məxsusəsi ilə qonuşan Azərbaycan türkü müxtəlif şivələrə malik və olduğu yerlərə nisbətlə müxtəlif ismlər daşıyan böyük türk millətinin bir qismidir.

Azəri türklərin hal-hazırda oturduqları yerlər min əl-qədim türk xəlqi ilə məskun olmuşdur. Gərək Bakı, Gəncə, İrəvan ilə Təbriz, Marağa, Ərdəbil, Xalxal və sair kibi vilayətlər və gərək Muğan, Aran, Qarabağ, Qaradağ kibi məmləkətlər daima türk xəlqinin oturağı və türk xanlarının ovlağı olub; bu yerlər kəndilərində bir çox türk sülalələrinin irili-xırdalı hökumətlər qurduqlarını, illərlə səltənət sürdüklərini görmüşlərdir.

"İdil" nəhrinin "Quzğun dəniz"ə töküldüyü yerdə böyük bir səltənət quran Xəzər türkləri daha miladi 700 sənələrində Kalmık səhrası ilə aşağıya doğru enmiş, Muğan düzənliklərinə yayılmış, daha sonra onları digər türk seylabələri təqib eləmişlərdir. Böyük Çingiz ilə Axsaq Teymurun cəngavər igidləri Kür boyu ilə Araz hövzəsini Ceyhun ilə Seyhuna bənzədigindən Turan köçbələrinə oturaq etmiş, Səlcuq hökmdarları isə artıq burasını qəti surətdə bir türk məmləkəti halına qoymuşlardır. Səlcuqlardan sonra bu ərazi əldən-ələ keçmiş, müxtəlif hökmdar və sülalə idarəsində qalmışlarsa da bunlar əksərən türk olub böyükləri müzməhil olduqda yerlərini, küçük də olsalar yenə birər türk xanlıqları tutmuşdur.



**Rəsulzadə Məhəmməd Əmin**
Cümhuriyyətimizin istiqlalını elan və ilk Azərbaycan hökumətini təşkil edən Azərbaycan Şurayi-Milli rəisi

Misal olaraq burada hökm sürən Azərbaycan Atabəyləri, Qaraqoyunlu və Ağqoyunlu türkmən bəylərindən Uzun Həsən və Qara Yusifləri göstərmək olar ki, kamilən türk ulus və oymaqlarından gəlmişlərdir.

Son dəfə olaraq rus istilasına məruz qalan Dərbənd, Quba, Bakı, Şəki, Şirvan, Qarabağ, Gəncə, İrəvan və Naxçıvan xanlarının dəxi azərbaycanlı türk xanları olduğu məlumumuzdur.

Xülasə, tarixin huşunda qaldığı bir zamandan bəri buralardakı qarlı dağlarla susuz aranlarda, yaşıl ovlaqlarla sıldırım qayalıqlarda, quzğun dənizlərlə yanar dağlarda, qəlbində hərarət, süfrəsində nemət bəsləyən bu mümtaz yerlərdə, insanın təbiətə tapındığı uzaq zamandan bəri ilahi bir nura məzhər olan bu ərzi-müqəddəsdə bir çox əsrlərdir ağalıq edən onlar; Muğan səhrasından Mil düzünə, Kalmık çölündən Aran vadisinə yayılan onlar; Şirvan silsiləsindən Qaradağa çapan, Şahdağın təpəsindən Savalan zirvəsinə qonan onlar; Kür ovlasından Qızıl Üzən çölgələrinə süzən yenə onlar, yəni türklər olmuşlardır.

Türklərin buralardakı hökmranlıqları Hindistan, Xorasan, Bağdad, İran və Misirdə olduğu kibi başqa bir cinsdən olan xəlqə əskəri bir sinif olaraq hökumət sürməkdən ibarət olmamışdır. Osmanlılardan başqa əksər türk hakimləri hökumət elədikləri xəlqə təmsil etmişkən, Azərbaycan türklərinin kütlə etibarilə milliyyətin rükni-mühümi olan dillərini halilə saxlamaları göstəriyor ki, Azərbaycandakı türk hökumətləri başqa cinsdən bir xəlqə müsəllət əcnəbi bir hökuməti-əskəriyyə degil, türk xəlqinin əksəriyyətinə istinad edir bir hökumət imiş. Rus istilasına qədər ərəb və İran istilasına rəğmən, Azərbaycan xanlıqlarının yarım müstəqil türk xanlıqları ha-

lında qalmaları, hətta İran Azərbaycanının belə türk sülalədən olan bir vəliəhd vasitəsilə idarə olunuşu bunu bir dərəcəyə qədər təyid etməzmi?!..

Hər nə qədər bundan yüz sənə müqəddəm Azərbaycan xanlıqları kəndi mənliklərini dərk etmədən, kəndisini tanımış milli bir sima göstərmədən mövqelərini İranın nüfuzi-mənəviyyəsinə, sonra da rusun qüvvəti-bazusuna tərk və qəzayə təslim oluyordusalar da, xəlq kəndisinə məxsus ədəbiyyatı, şairləri, aşıq və dərvişləri ilə hüzn və məsərrətini kəndi lisanı ilə tərənnüm ediyor, kəndi idrakı ilə bir vücud olduğunu bəlkə sezmədən sezdiriyordu.

Əvət, rəhləsi üstündən enməyən Füzulisi, Koroğlusu ilə bağrı yanıq Kərəmə ağlayan aşıqları, bu aşıqların ürək dağlayan sazları ilə çobanların ruha sinən bayatıları, çocuqların sevə-sevə əzbərlədikləri "üşüdü"ləri kəndisini iranlı bilən bu xəlqin müdhiş bir zəlalətdə olduğunu göstəriyor:

– Yox degil, siz türksünüz! – diyordu.

## II

Bu türklər Azərbaycanı ikiyə bölən Araz nəhrinin iki tərəfində sakin olub qismən də İrana şu və ya bu surətlə bağlı nim müstəqil bir halda yaşadıqları zaman zahirən məhkum bir millət degil, hakim olaraq yaşıyorlardı, İran təxtində oturan sülalə kəndi cinslərindən bir türk sülaləsi idi. İranı və İran dairəyi-nüfuzunda olan xanlıqları xarici düşmənlərə qarşı ciddiyyətlə müdafiə edən şahzadə, yenə bir türk şahzadəsi idi. Abbas Mirzənin istinad elədigi nöqtə Təbriz olduğu kibi, ümid bağladığı qüvvə dəxi Azərbaycan türkləri idi.

Azərbaycan xəlqi idarəcə gördügü ağırlığı başqalarından degil, öz cinsindən gördügü üçün həqiqi məhkumiyyətini mə-

nəviyyatca tamamilə başqa bir ruh və yabançı bir mədəniyyət məhkumu olduğunu dərk etmiyordu. Get-gedə farslaşıyordu. Xəvas təhsilini tamamilə farsca görüyor, fars tərbiyəsi alıyor, bir fars kibi düşünüyor və kəndisinin doğrudan-doğruya iranlı olduğunu təsəvvür ediyordu. Xəlqin hal və əqdini əlində bulunduran bu xəvas kibi mənəviyyatma hakim bulunan üləma sinfi dəxi eyni ruhda, eyni tərbiyədə, eyni zehniyyətdə idi.

Fars ədəbiyyatına Məhsətilər, Nizamilər, Qaani və Xaqanilər kibi ustadlar bəxş edən bu Azərbaycan xəvası pək təbii idi ki, bir zaman Osmanlı sultanı-müqtədiri Süleyman Qanuninin belə az qala qəbul elədigi Sədi lisanı qarşısında əriyib kəndiliklərindən keçmiş, türk ilə türkcəyə yuxarıdan aşağı bir baxışla baxmışlardı.

İranın o dəhşətli və cahanbəha ədəbiyyatı və o ədəbiyyat sayəsindəki qüvvətli mənəviyyatı qarşısmda təslim olub da təməssül edən türk xəvasının bittəbii əvam üzərinə dəxi böyük təsiri olacaqdı. Həm olmuşdu. Türk kəlməsi türk xəlqinin kəndi dilində – şayani-heyrətdir ki, – təhqiri-mütəzəmmin bir məna yerində istemal olunuyordu. Bunun tətmələrini imdiki halda belə görmək mümkündür. "Türksayə" sözünün avamımız arasında "sadəlövh" mənasında işləndigi, "türkün sözü" təbirinin səthi mənada söylənən sözlərə ələm olduğu, "türk demişkən" əlavəsinin sameyi təhqir edən mənalara iltibas edən kəlmələrdən ayrılmayan bir rədif halmda gəlməsi iştə o zehniyyətin təsiridir. Fəna təsir kəndiligini qeyb edən xəvasın xəlqə təlqin elədigi "qədəhi-nəfs"dən hasil olmuşdur.

Xəvasın bu dərəcədə təməssül etməsi azərbaycanlıları tühəf bir millət halına qoymuşdu:

Dili başqa, yazısı başqa bir millət!



**Topçubaşov Əlimərdan bəy**
Azərbaycan Məclisi-Məbusan rəisi

Mavərayi-Araz Azərbaycanı hala bu haldadır. Orada hər kəs türkcə söylər. Fəqət eyni zamanda yazılar tamamilə farsca yazılar.

Fəqət kəndiligindən keçmiş xəvas girdigi bu yalnış yolun çıxılmaz birahə olduğunu sezmədigi halda, əvam pək də laqeyd degildi. Xəlq qeyri-təbii olan bu halə ünsüri bir surətdə müqabilə ediyordu. Türk demokratiyası kəndisinin kimsənin sezmədigi və əhəmiyyət vermədigi lamilliləşdirilməsinə qarşı qiyam eləmişdi. Bu qiyamın qəhrəmanları isə xəlq şairləri ilə dastançı aşıqlar idi. Laüdəri müsənniflərin yaratdığı "Koroğlu", "Əsli və Kərəm", "Aşıq Qərib" və sair bu kibi ədəbiyyat, ürək yaxan aşıq sazlarının ruhnəvaz ahəngləri altında Azərbaycan türk xəlqinin qəlbinə öylə siniyor, öylə yerləşiyordu ki, onunla degil farsın "Nuşi-afərin"i, "Rüstəm və Söhrab"ı, hətta Firdovsi ilə Hafizi belə rəqabət edəməzdi. O, öz Firdovsisini, öz Hafizini, öz Sədisini – doğma türk şairini və ruhundan xəbər verən Azərbaycan şeirini arıyordu.

Bərəkət versin ki, xəvasın həpsi ondan rugərdan olmamışdı. İştə bu, doğduqları mühitdən tamamilə rugərdan olmayan Azərbaycan şairləri xəlqin ehtiyacını tətmin edərək türkcə şeirlər yazmaya başlamışlar, xəlq ədəbiyyatmda əlavə yazı ədəbiyyatının əsasını dəxi vəz eləmişlərdi.

Bu olduqca ağır və müşkül vəzifəyi Füzuli məşrəbli türk şairləri müvəffəqiyyətlə gördülər. Bu müvəffəqiyyət üzəmanın bir təfsili-təhlili kəndi başına mühüm bir mövzu olsa da sədədimizin xaricində olduğu əlbəttə təqdir olunur. Biz ondan yalnız maddətən hakim ikən mənən məhkum olan xəlqimizdə mənən dəxi məhkum olmamaq üçün bir təşəbbüs və həyat əsəri mövcud olduğunu göstərmək üçün ötəri olaraq bəhsə lüzum gördük.

Şimali Azərbaycan rus təhti-idarəsinə keçdikdən sonra məhdud olsa da, malik olduğu siyasi hüququnu tamamilə itirmiş, maddi məhkumiyyətin bütün acısını dadmışdı.

Əvvəlki idarə zamanında gördügü mənəvi əsarətini müştərək bir din və yaxın bir ruh təsirilə pək də sezməyib getdikcə farslaşan Azərbaycan türkü bu dəfə də ruslaşdırılmaq siyasətinə məruz qalmışdı. Fəqət bu siyasətin bir ayağı cəbrə bağlı olduğundan və tamamilə yabançı bir ruha malik bulunduğundan təbii idi ki, xəlqin müdafieyi-nəfs hissini daha ziyadə qıcıqlıyor, onu daha sürətli bir surətdə kəndisini düşünməyə vadar ediyordu.

Bir vəqt hökumət tərəfindən təyin olunan mollalar "dəftər mollası", rus şkolunda oxuyan bəy balalarına dəxi "rus balası" deyən xəlq kəndi hədəsilə duyduğu ruslaşdırmaq siyasətinə bildigi kibi müqabilə etmişdi. O dəftər mollasına qarşı öz axundunu, ministerstvo şkoluna da məktəbxanasını qarşı qoymuşdu.

Xəlqin hədəsi doğru idi. O, axundunun hürriyyəti və mədrəsə ilə məktəbinin istiqlalı üçün pək həqli və pək məqul bir mübarizədə idi. O, maddətən məhkum olduğuna razı olmuş, fəqət mənən dəxi məhkum olmaq istəmiyordu.

Fəqət xəvas yenə yanılmışdı. Vəqtilə Firdovsinin təmtəraq üslubu, Sədinin hikməti, Xaqaninin təğzili qarşısında bayılan "mirzə" bu dəfə də Lermontovun ruhu, Puşkinin üslubu, Tolstoyun fəlsəfəsinə vurulmuş bir "uçitel" idi.

Sənələr keçdi. Şkol uçiteli ilə məktəb müəllimi anlaşamadılar.

Farslaşmış mirzə kibi ruslaşmış uçitel dəxi xəlqin hədəsnən duyduğu mətləbi bir çox zaman dərk edəməmişdi. Nəhayət, bir çox birahələrdən keçdikdən, məktəb və mədrəsələrə qarşı bilüzum, daha doğrusu, biüsul mübarizələrdən sonra "uçitel" artıq əsl mətləbi anladı. Bildi ki, Sədiyi də, Tolstoyu da türk

xəlqinə öğrətmək, türkü onlarla aşina etmək həm lüzumlu, həm faidəlidir. Fəqət bununla bərabər türkü kəndi sədisindən, kəndi tolstoyundan məhrum etmək olamaz.

Sədiyi, Tolstoyu və sair dünya müşahiri adını anlamaq üçün kəndi füzulilərini, nəbatilərini – gözə nə qədər küçük də görünsə – seyyidlərini, sabirlərini öğrətməlidirlər.

Bu zəmin üzərində rus məktəbi vasitəsilə mədəniyyəti hazirəni az-çox dərk etmiş ürəfa ilə xəlq arasında yekdigərini anlamaq dövrü başladı.

Artıq Azərbaycan türkünün oyannmaq zamanı gəlmişdi. Və zamanın bizə nələr verdigini mən degil, məcmuəmizin digər qismində mütəxəssis arkadaşlarımız sizə ərz edəcəklərdir. Bən isə yalnız:

Malik olduğumuz müasir ədəbiyyat, mütəəddid mətbuat, zəngin teatro, parlaq musiqi, mütəşəbbüs tüccar, gözü açıq əmələ, siyasi firqə, mühərrir, aktyor, mühəndis, memar, hüquqşünas kibi siniflər, zükur ilə ünasə məxsus məktəblər və sair bu kibi müəssisatımızla biz, məhkum ikən artıq hakim olmaya namizəd bir millət olmuşduq – deyirəm.

Əvət, daha Azərbaycan Molyeri Mirzə Fətəli Axundov mərhumla başlayan müasir ədəbiyyat həvəsi, Həsən bəy Məlikov mərhumun "Əkinçi" qəzetəsi ilə mətbuati-milliyyə təsis və davamına həsr olunan əmək, cəmiyyəti-xeyriyyə binası üçün bundan 40 il əvvəlinə aid olan təşəbbüs, nəhayət milli ədəbiyyat, milli məktəb tələbləri, şeyxülislamla müfti və sair axundlarımızın təyinlə degil, intixabla oluşunu istəmək, daha çarlıq zamanında məktəb və mədrəsə islahı yolunda təvəlli edən o bitməz-tükənməz davalar başqa bir şey degil, yalnız bir dava idi:

– Hakimiyyəti-milliyyə davası!



**Fətəli xan Xoyski**

Cümhuriyyətimizin əvvəlinci hökumət rəisi

## III

Hakimiyyəti-milliyyə davasının 1905-ci Rusiya inqilabısəğiri nəticəsində hasil elədigi qazanclar var idi: milli məktəb, milli mətbuat, milli cəmiyyətlər təsisi həqqində cüzi müsaidat. Bu müsaidələrdən istifadə ilə böyük müharibə ərəfəsində və inqilabi-kəbirin patladığı zamanda Azərbaycan türkü Rusiyadakı sair türklərlə birlikdə artıq siyasi idrakdan məhrum, arzui-milliyyəsi inkişaf etməmiş lal bir kütlə halında degil, həyatını ibraz edəcək vasitələrə malik diri və yaşamaq istədigini hiss etdirən bir vücud halında idi.

On sənəlik kiçicik bir nəfəs Azərbaycan türkünü mütəəddid mətbuata, müxtəlif cəmiyyətlərə, siyasi firqələrə və təşkilata, zamandan, məkandan anlar xadimlərə malik idrak sahibi bir cəmiyyət halına qoymuşdu.

Bu cəmiyyət 1914 sənəsində patlayan aləmşümul müharibənin alt-üst elədigi məna və qiymətləri böyük bir həssaslıqla təqib ediyor, topların gurultusu ilə bərabər qopan "Millətin hüququ müqəddəsdir!" nidasını dörd qulaqla dinliyor, müharib bulunan bütün dövlətlərə mənsub rical ağzından sıx-sıx eşidilən bu şüarın səmimiyyətinə degilsə də, bu böyük həqiqətin istər-istəməz elani-zəfər edəcəginə iman ediyordu; bu imanın tərcümanı olmaq üzrə daha Rusiya inqilabı zühur etmədən, müharibənin qatı sansoru hər yazılanı bilaaman pozmaqda, bilxassə türk kəlməsi ilə türkcənin məsləkinə qarşı düşmənanə bir vəziyyət aldığı bir zamanda "Açıq söz" qəzetəsi yuxarıda məzkur imana tərcüman olaraq yazıyordu ki:

"Dəhşətlərinə şahid olduğumuz böyük müharibə böyük bir həqiqəti – əsrimizin milliyyət əsri olduğunu isbat etdi.

"Dünyanın xəritəsi qəribə dəgişəcək" – deyə heyrətlə qarışıq bir cümlə imdi bir çox ağızlardan eşidilməkdədir.



**Həsən bəy Ağayev**
Məclisi-Məbusan rəisi baş müavini

Dünya xəritəsinin alacağı yeni şəklə vətəndaşların fədakarlığı, dövlətlərin təşkilatı və orduların əzəməti ilə bərabər heç şübhə yoxdur ki, vüzuh və rüsux peyda etmiş milliyyət məfkurələrinin də böyük təsiri var və olacaqdır.

"Özünü lüzumunca bilib də istiqbal üçün müəyyən bir ideal (məfkurə) bəsləyən millət şübhəsiz ki, böyük bir qüvvət təşkil edər. Şübhəsiz ki, sözün tam mənasilə deniləcək qədər gövəfkən topların hakim olduğu hərb meydanlarında təsirsiz qalmayan bu qüvvət yaşıl mahutlu barışıq masası üzərində də əsaslıca bir təsir yapacaq.

"Hər hanki qalib tərəf az-çox sevrincəli bir dinclik vücuda gətirmək isrərsə, əsrin vicdanları üzərində ən çox təsir icra edən qüvvəti – milliyyət məfkurəsini ehmal edəməz! Bunun böylə olacağı arabir gələcək sülhi həqqində söz söyləyən Avropa mütəfəkkirlərincə də təsdiq olunmaqdadır. Sülhyunə mənsub siyasilərcə milliyyət əsasına riayət etməyəcək, millətlərin hüququnu gözətməyəcək bir sülh əqdnaməsi çox çəkməz yırtılar və survencli bir dinclik təmin edəməz.

"Hüquqi-təbiiyyəsi paymal olmuş bir millət baqi qalıncaya qədər Avropa müvazineyi-düvəliyyəsi həqiqi və survencli bir sülh üzü görməkdən məhrum qalacağı kibi, kəndi vətəndaşları arasında ögey-doğmalıq gözədən bir dövlət də həqiqi bir qüvvətə söykənmiyəcək, mütərəqqi və qüvvətli bir təşkilata malik olmayacaqdır".

"Deməк ki, müəyyən bir məfkurəyə və əksər əfradınca müşəxxəs bir qayeyi-amala malik olan millətlər, dövlətlər arasındakı münasibatda əhəmiyyət qazandıqları kibi, dövlətlərin daxili siyasətləri üzərinə də böyük təsirlər icra edəcəklərdir. Bu surətdə ayrı-ayrı millətlər bir millət olaraq yaşaya bilmək üçün hər şeydən əvvəl özlərini bilməli, müəyyən fikir və amallar ətrafında birləşərək böyük bir məfkurəyə, qayeyi-

xəyalə hədəf olacaq o işıqlı yıldıza sahib olmalıdırlar. Çünki müttəhid bir ruh və müştərək bir qayəyə malik olmayan millətlərlə yeni əsaslar üzərinə qurulacaq həyat hesablaşmayacaq və böylə bir səlahdan məhrum qalan cəmaətlər kimsəyə söz eşitdirəmiyəcəklərdir!"[1].

Böyük müharibənin Azərbaycan türklərində doğurduğu ümid böylə idi.

Milliyyət prinsipinin qalib gələcəginə bağlanmış bir ümid!

* * *

Rusiya imperatorluğunun 1917-ci ildə Karpat, Polşa və Baltik sahillərindəki o görünməz məğlubiyyəti, dünyanı sarmış atəşin hərb zəncirinin mühüm həlqələrindən birisini qırmış oldu.

Rusiyayı təzyiq edən çarizm dəxi bu həlqə ilə bərabər süqut eləmişdi. Böyük müharibə böyük bir inqilab doğurmuşdu.

Dünyanın altıdan birisinə sahib olub da 72 milləti qahir bir idarə altına toplamış olan böyük Rusiya imperatorluğunda zühura gələn bu inqilabi-kəbir iki dürlü nəticə verəcək, iki mühüm məsələyi həll edəcəkdi; yoxsa inqilab kəndi ruhu və kəndi təbiətinə zidd olub özü ilə bərabər Rusiyayı da qəhr edəcəkdi:

Rusiya inqilabı məhkum siniflərə hürriyyət verəcəgi kibi, məhkum millətləri də qurtaracaqdı.

Bunun üçün idi ki, mart inqilabını hər kəsdən ziyadə köylü və əmələlərlə məhkum millətlər böyük bir həyəcan və sərvərlə qarşılamış, haman kəndi hüquqlarının istehsalı üçün yubanmadan təşkilata başlamışlardı.

---

[1] 2 oktyabr 1915, "Açıq söz", №1

Məclisi-Müəssisan bir an əvvəl toplanacaq, köylülərə torpaq, əmələlərə iş, millətlərə də muxtariyyət verəcək iştə ümumi bir arzu!

Məclisi-Müəssisandan kim nə gözlüyor?

İctimalar, qurultaylar, qərarlar, qətnamələr həp bunu təyin eləməkdə...

Qafqasiya daxil olduğu halda Rusiya türkləri dəxi bu xüsusu ehmal etmiyorlardı.

Bakıda aprelin 15-də ilk dəfə olaraq Qafqasiya müsəlman qurultayı toplanıyor. Qurultay hər şeydən daha əvvəl və hər məsələdən daha qızğın bir surətdə azad Rusiyanın alacağı mətlub olan şəkli-idarəyi müzakirə ilə aşağıdakı qərarı çıxarıyor:

"A - Qafqasiya müsəlman qurultayı, milli siyasi məqsədlər həqqindəki məsələyi müzakirə edərək müsəlman qövmlərinin mənafeini ən ziyadə təmin edən Rusiya şəkli-idarəsinin məhəlli federasyon əsası üzərinə qurulu cümhuriyyəti-müctəməiyyəyi-ənam olduğunu qəbula qərar verir".

"B - İslam dinində olan bütün qövmlərin ruhani və mədəni irtibatını nəzərə alaraq Qafqasiya müsəlman qurultayı bütün Rusiya müsəlmanlarından ötrü vəzi-qəvanin səlahiyyətinə malik ümumi bir idarə təşkilini lazım görür".

Bu qətnamə günlərlə davam edən münaqişə nəticəsində bir növ etilaf nəticəsi olaraq müttəhidən qəbul edilmiş idi. Münaqişə bir tərəfdən türkçülər, digər tərəfdən də islamçılarla sosialistlər arasında idi. Federasyon əsasını müdafiə edənlər türkçülər idi ki, xüsusi olaraq Azərbaycana məhəlli muxtariyyət tələb ediyorlardı. Müarizlər isə yalnız xəlq cümhuriyyəti ilə iktifa edib milliyyət məsələsini isə məhəlli degil, mədəni muxtariyyət surətilə həll ediyorlardı.

Apreli mütəaqib may ayında Moskvada bütün Rusiya müsəlmanlarının ümumi qurultayı iniqad eləmiş, Rusiya türklügünün bütün ənvaini təmsil edən bu min mürəxxəsli böyük qurultay eyni mövzuda bu sətrləri qaralayan mühərririn islamçı-sosialistlərə qarşı müdafiə elədigi məruzə üzərinə vaqe olan şiddətli münaqişələr nəticəsində Rusiyanın milli-məhəlli muxtariyyətlər üzərinə qurulu qoşma xəlq cümhuriyyətindən ibarət olması tələb olunuyordu. Bu tələb Rusiya müsəlmanlarının böyük inqilabdan gözlədikləri siyasi məqsədi tamamilə əyan eləmişdi.

Nəhayət, Məclisi-Müəssisan seçkiləri əsnasında Qafqasiya türkləri arasında qate bir əksəriyyət qazanan onuncu nömrəli siyahı Rusiya federasyonu ilə bərabər Azərbaycan muxtariyyətini dəxi bir şüar olaraq ortaya atmışdı.

Paytaxtımızın böyük bir təvəccöhi altında iniqad edən Türk Ədəmi-Mərkəziyyət "Müsavat" firqəsinin qurultayı isə Rusiya türklügünün Rusiyanın şəkli-idarəsi həqqində bəslədigi amalı tələblər etdirərək proqramını aşağıdakı vəchlə təhrir ediyordu:

"1. Rusiya dövlətinin şəkli-idarəsi milli-məhəlli muxtariyyətlər əsası üzərinə qurulu qoşma xəlq cümhuriyyətindən ibarət olmalıdır.
2. Hürriyyəti-kəlam, mətbuat, vicdan, ictimaat, təşkilat və tətil kibi siyasəti hürriyyətlərlə bərabər, muxtariyyətlərdəki hökumət təşkilinin qoşma xəlq cümhuriyyətindən ibarət olması, işçi qanunlarının bütün muxtariyyətlərdə bir növlə tətbiqi və topraq məsələsinin əsasən keyfiyyət həll və islahı kibi demokratik əsaslar, Rusiya qoşma xəlq cümhuriyyətinin qanun əsasına daxil olub dövlətcə təhti-təminə alınmalıdır.

3. Müəyyən məhəllə malik olan (yəni Rusiya məmləkətinin müəyyən bir qitəsində əksəriyyətlə yaşamaqda bulunan) hər bir millətə muxtariyyət həqqi verilməlidir.

Firqəcə Azərbaycan, Türküstan, Qırğızıstan və Başqırdıstan kibi türk ölkələri məhəlli muxtariyyət almalıdırlar. İdilboyu ilə Krım tatarları və digər Rusiyada yaşayan türk qövmlərinə məhəlli mümkün olmazsa, milli muxtariyyət verilməlidir.

**Qeyd:** Başqa türk olmayan dindaşlara da firqə muxtariyyət tələb edib onlara hər vəchlə yardım etmək borcundadır.

4. Müəyyən məhəllə malik olmayan millətlərə milli-mədəni muxtariyyət həqqi verilməlidir.
5. Muxtariyyətlərin hüdudunu təyin etmək daxili qəvanini-əsasiyyələrini tərtib eləmək gərək məhəlli və gərək milli muxtariyyətlərin kəndi məclisi-müəssisanlarında həll olunmalıdır.
6. Cümhuriyyət heyətinə daxil olan muxtariyyətlər öz aralarında müştərək gördükləri məqsəd və mətləbləri üzərinə əqdi-ittifaq edə bilməlidirlər.
7. Cümlə muxtariyyətli əyalətlər, mərkəzi hökumət ilə ancaq vətən müdafiəsi, məskukat, gömrük, xarici siyasət, dəmiryol, poçta, teleqraf və sair bu kibi ümumi işlərlə mərbut olmalıdırlar.
8. Muxtariyyətli əyalətlər, idari, mali, təşri, mədəni və ədli kibi daxili məsələlərdə müstəqil olmalıdırlar.
9. Rusiya cümhuriyyətinin ümumi işlərini idarə etmək üçün bütün muxtariyyətlərin nümayəndələrindən ibarət bir konqre təşkil olunmalıdır.
10. Hər bir muxtariyyətli əyalətin mərkəzində qanun qoymaq vəzifəsilə müvəzzəf bir məclisi-məbusan və qo-

yulan qanunları icra etmək vəzifəsilə müvəzzəf bir şurayi-vükəla (heyəti-nüzzar) təşəkkül etməlidir.

11. Hər bir muxtariyyətli əyalət məhəlli işlərində geniş imtiyazlara malik vilayət, qəza və nahiyələrə bölünməlidir.

12. Hər bir muxtariyyətli əyalətin rəsmi dili haman əhalinin əksəri söylədigi dil və şivə olmaqla bərabər vilayət və qəzalarda yerli əhalinin söylədigi dil və şivə işlənməlidir"

İştə "Açıq söz"ün 1915-ci ildə hərbi-ümumidən gözlədigi hakimiyyəti-milliyyə düsturu qələbəsindən bəslədigi ümidi 1917-ci ildə Rusiya inqilabından bilaistifadə meydani-ələniyyətə çıxan "Müsavat" firqəsi yuxarıdakı vəchlə təlxis ediyordu.

Bu surətlə Azərbaycan türkü dünya müharibəsi ilə Rusiya inqilabından kəndi hürriyyəti-milliyyəsinin təminini gözlüyordu.

### IV

Rusiya inqilabı imperatorluğu içindən təzyiq edən iki qüvvətin taşımasından hasil olmuşdu: bir tərəfdən məhrum siniflər, digər tərəfdən də məhkum millətlər baş qaldırıb həqlərini tələb ediyorlardı. Köylü topraq, əmələ iş, velikorus olmayan millətlər də həqq və muxtariyyət istiyorlardı.

Böyük inqilab bu tələblərin həpsinə hesab vermək məcburiyyətində idi. Məəmafiə bunları fövqündə digər mühüm bir tələb dəxi duruyordu ki, bu da bir an əvvəl hərbi bitirmək idi.

Hökuməti-müvəqqətə, bilxassə Kerenski hökuməti inqilabı hərbi müvəffəqiyyətlə bitirmək üçün bir vəsilə olaraq kullanmaq istədi. Xətərnak bir təcrübə yaparaq inqilab ordusu ilə düşmənə ciddi bir hücum hazırladı.



**Yusifbəyli Nəsibbəy**
Lahiqə heyəti-vükəla rəisi

Bu surətlə bütün ciddiyyət və fəaliyyətini "zəfəri-nəhayi"yə sərf edən inqilab hökuməti bittəb inqilabın tələb etdigi əsaslı məsələlərin həllini təxir etdirmək məcburiyyətində idi. Bu məcburiyyət isə həm cəbhədə, həm də əqəbədə böyük bir hərəkata mövcib oluyordu.

Əfkari-ümumiyyə inqilabın ortaya atdığı "ilhaqsız və təzminatsız sülh", "millətlərə təyini-müqəddərat həqqi!" şüarları ilə topraq və əmələ məsələlərinin bir an əvvəl qövldən-felə gətirilməsini tələb ediyor, hökumət isə hər şeyi məclisi-müəssisana təviq ediyordu.

Bu təviq siyasəti bir tərəfdən bolşevizmi, digər tərəfdən milli cərəyanları qüvvətləndiriyordu. Bilxassə Kerenskinin Finlandiya Seymi ilə Ukrayna Radasına qarşı aldığı tövri-təhdid ilə Almaniya üzərinə müvəffəqiyyətsiz bir surətdə icra elədigi hücum artıq bolşevizm zühuruna meydan vermişdi.

Bolşeviklər Kerenski hökumətindən qaçaq bir halda müxalifət vəziyyətində ikən "hər nə qiymətə olsa da sülh!" şüarını ortaya atmaqla əskərləri, "hər millət Rusiyadan ayrılmağa qədər azaddır" ünvanı ilə də bütün millətləri qazanıyor, hökuməti-müvəqqətənin xətalarından kəndi hissələrinə faidələr çıxarıyorlardı.

Nə qədər ki, Lenin gizlənmək məcburiyyətində, yəni mərkəzdəki bolşeviklər zəif bir halda idilər, o qədər ətrafındakı bolşeviklər muxtariyyət şüarlı firqələrə müzahir görünüyorlardı. Əzcümlə Bakıda olan bolşeviklər rəqibləri və can düşmənləri menşeviklərlə ciddən mübarizə etdikləri halda, menşeviklərin bir dürlü yaxın burakmayıb da "gözüm çıxdı"ya saldıqları türk milliyyətçilərinə yaxınlaşıyorlardı. "Müsavat" firqəsi, məsələn əmələ şurası menşeviklərdə ikən burjua bir firqədir – deyə yaxın buraxılmadığı halda bolşeviklərcə menşeviklərlə eserlərə tərcih ediliyordu.



Azərbaycan hərbiyyə naziri, topçu
**Səməd bəy Mehmandarov**

Petroqradda hökuməti əlinə alır-almaz Lenin bütün müsəlman millətlərinə bir xitabnamə nəşr eləmişdi. Bu xitabnaməsində o, əsarət altında bulunan şərqə peyğəmbəranə bir əda ilə hürriyyət və istiqlaliyyət vəd və təmin ediyordu.

Fəqət bolşeviklər müxalifətdən hakimiyyətə keçincə "söz"lə "iş"in nə dərəcədə biri-birindən uzaq olduğu bir dəfə daha təhqiq etdi.

"Təyini-müqəddərat həqqi" hər kəsin degil, zəhmətkeşlərindir – deyə ortaya yeni təfsirlər çıxdı. Azərbaycan muxtariyyəti demokratiyanın degil, "xanların, bəylərin, ağalarındır" – deyə əda dəgişdi. Lenin mərkəzdə yerini bərkişdirdikcə vilayətlərdəki həvariləri haman birər mərkəziyyətçi və bir dərəcəyə qədər də böyük rusiyaçı bir şəkil və sima almaya başladılar. Məhkum millətlər qara Rusiyadan eşitdikləri təhdidləri bu kərə də qızıl Rusiyadan eşidiyorlardı.

Azərbaycan məsələsində isə bu təhdid müəyyən bir şəkil alıyordu. Bolşevik qəzetəsi "Bakinski raboçi" bənimlə yapdığı bir münaqişədə diyordu ki: "Azərbaycanın muxtariyyəti türk burjuaziyasının muxtariyyətidir". Və "Qafqasiya muxtariyyətinə nə Rusiya burjuaziyası nə də Rusiya demokratiyası razı ola bilər". "Azərbaycan muxtariyyətini istəyən müsavatçılar nəticədə xarabazar bulurlar". Bolşeviklərin Bakıda "Müsavat"a nisbət aldıqları tövri-təhdid Türküstan, Krım, Ukrayna, Finlandiya kibi vilayətlərdə artıq əlani müharibə və qital şəklini almışdı.

Azərbaycanlılar kadetlərin dilindən "nə istərsəniz verəlim, yalnız Abşeron yarımadasına toxunmayınız" dediklərini eşitmişlər idi. Bolşeviklərdən dəxi eyni təklifi eşitdilər. Fəqət bir kərə muxtariyyət fikrinə süluk edən millət artıq əzmindən dönməyəcəkdir. Bolşeviklərin muxtariyyətə qarşı xərabələrlə təhdid edən məqaləsinə qarşı "Açıq söz": "Bəlkə

də müqəddərdir ki, muxtariyyətimizi xərabəzarlar qiymətinə alalım. Müqəddərati-tarixiyyədən əlbəttə ki, boyun qaçırmaq olmaz" – deyə mütəvəkkilanə bir surətdə müqabilə ediyor; "Əlbəttə, bir Lenin dəxi çıxar bizim muxtariyyətimiz haqqında "dekret" verər, kinayəsi ilə əzmi-milliyyənin böyük müşkülatla olsa da axırı istədiginə nail olacağını ümid ediyordu.

Artıq müsəlmanlara bir dost kibi görünən solların da sağlar kibi hakimiyyətpərvəranə bir məqsəd təqib elədikləri meydanda idi.

* * *

Tiflisdə qüvvətli bir təşkilata malik olan menşevik firqəsinə qarşı dikiş tutduramayan bolşeviklər Bakının daima bir inqilab halında bulunan əmələ məhəlli olduğunu istifadə üçün buraya köçmüşlərdi.

Bakıda birləşmək və burasını kəndilərinə ümidli bir istinadgah yapmaq istəyən bolşeviklər bittəbii yerlilərin milli bir hökumətə doğru gedən məqsədlərilə mübarizə edəcəklərdi. Bunun üçün də onlar türklərə qarşı mübariz bir vəziyyətdə olan ermənilər ilə təşriki-məsai edəcəklərdi.

Nəhayət öylə çıxdı. Bolşeviklər qüvvətləndikcə daşnaksaqanlara nisbət xətti-hərəkətlərini dəgişdirdilər. Biləks milli müsəlman komitəsi ilə "Müsavat" firqəsinə qarşı bir tövrimüxalifət aldılar.

Bu aralıq Tiflis-Bakı yolundakı anarşidən naşi Bakıda toplanıb qalan naməmnun əskərlərin vücudi dəxi bolşeviklər tərəfindən mahiranə bir surətdə istifadə olunuyordu. Mühüm hadisələr hazırlanıyordu.

Şaumyan idarəsindəki "sovet"in müsəlmanlara qarşı tutduğu sərd məslək gündən-günə şiddət ediyordu. Gözləri qa-

bağında erməni milli əskərlərinin azadlıqla gəzdiklərini görən xəlq müsəlman firqəsi zabitlərinin tovqif olunduğunu və firqə nəfəratmın təərrüzə düçar olduğunu görüncə bittəbii ğələyana gəliyordu.

Bu surətlə gündən-günə çuğlayan yandırım axırı bir fitnə odu ilə tutuşdu. Bu yanğın 1918-ci il mart ayının 17-dən 21-nə qədər davam edən qanlı mart hadisələrinə səbəb oldu.

Mart hadisələri bolşevizm məsləkinin hər yanda yandırdığı daxili vətənyun müharibəsi şəklində çıxarılıb adəta milli bir qital şəklini aldı. Başda daşnaksütyun olaraq ermənilər türklərdən intiqam almağa başladılar. Bütün mənası ilə bir erməni-müsəlman qitalı üz verdi.

"Hökm etmək istərsən ayır!" şüarını yalnız Nikolayların canişinləri degil, Leninin komissarları dəxi kəndilərinə düstur ittixaz eləmişlərdi.

Qəribədir: qanlı çarizmin hakimiyyəti-milliyyə davasına verdigi cavab – qanlı qitallar idi.

Qızıl bolşevizmin cavabı da eyni mahiyyətdə olmaqla bərabər daha fəci və daha qəddar bir şəkil aldı.

Şaumyan sözünü tutmuşdu. "İsmailiyyə" binası, Azərbaycan fikrinin o qaynar ocağı ilə "Açıq söz" idarəsi birər xərabəzarə döndərilmişdi.

## V

*"Xuni-ərbabi-həmiyyət qərq edər zalimləri*
*Məşəli-əfkar əhraranə sönməz xun ilə!"*

Azərbaycan türkünün böyük inqilab tərəfindən elan olunan təyini-müqəddərat həqqindən istifadəyə qalxdığını bolşeviklər Bakı küçələrini qanlara qərq etməklə boğmaq və

İsmailiyyə binasında yakılan hürriyyət məşəlini o möhtəşəm binanın külləri altında söndürmək istədilər.

Bakı böylə müdhiş bir cinayətə məruz qaldığı zaman Azərbaycan fikir və idealını təmsil edən müsəlman məbusları Tiflisdə idilər. O zaman Tiflisdə bir tərəfdən türklərlə müsalihəyi, digər tərəfdən də Rusiyadan əbədiyyən ayrılaraq elani-istiqlal eləmək məsələsi tədqiq və müzakirə etməkdə olan Zaqafqasiya "seym"i iniqad ediyordu. Zaqafqasiya müsəlman məbusları dəxi "seym"də iştirak ediyorlardı. Zatən Bakı faciəsi bolşeviklərin müsəlmanların seymdəki istiqlalçı politikalarına qarşı bir intiqam və cəza siyasəti idi.

Zaqafqasiyanın bolşevizm anarşiyasından müdafiəsinə qurban gedən Azərbaycan mərkəzi-siyasəti Bakı bittəbii Tiflisin müavinətini bəsləmək həqqinə malik idi. Bütün Azərbaycan azərbaycanlıların da iştirakı ilə təşəkkül edən "seym" məclisi ilə Zaqafqasiya hökumətinin məlumatına intizar edib duruyordu.

Fəqət heyhat! Azərbaycanlı "seymi" əzasının yüksək səda ilə bağırıb-çağırması Tiflis hökumətinin həqiqi sahibləri olan gürcü menşeviklərini yerindən qımıldatamadı. Gürcüstan daxilindəki bolşevizmi min şiddət və qəhrlərlə basdıran bu ağalar Bakıya qarşı quru elani-hərb belə etmək istəmədilər. Gəncə milli müsəlman komitəsinin təşkil elədigi istixlas ordusuna isə milyonlarla patron, onlarla pulemyot və bir kaç top vəd etdilərsə də, vədlərini tutmadılar. Tiflis mətbuatı isə Bakının Azərbaycan "başıpozuq" qüvvəti ilə istirdadına açıqdan-açığa etiraz etdi. Nəhayət, hər qism bəhanələri yeritdikdən sonra gürcü Ser Amdan siyasəti "qarşımızda türk təhlükəsi varkən kəndilərilə ehtimal ki, əqdi-ittifaq etmək zərurətində bulunacağımız bolşeviklərlə münasibatımızı pozamayız" izah və etirazında bulundular.

Əvvəlcə müsəlmanların intiqamından, Tiflisin müavinətindən qorxan üsyankar Bakı tədafei bir vəziyyət almış ikən, sonra cəsarət peyda etmiş, bolşevik Bakı Gəncəyə doğru hərəkət eləmək qəsdinə düşmüş idi. Bu hərəkətə ilk əvvəl Şamaxı, daha sonra Lənkəran, Salyan, Quba, Kürdəmir, Nəvahi və sair qitələr məruz qalmış, şəhərlər xak ilə yeksan, irz və namuslar hətk, mal və məvaşi qənimət edilmişdi. Gəncə bizzat təhdid olunmaqda, digər tərəfdən dəxi Qarabağ erməniləri Bakı bolşeviklərilə birləşmək üzrə bir plan hazırlamaqda, Azərbaycanın atəş və qılıncla təslimə məcbur edilmək planı cızılmaqda idi.

Məlum a, Şaumyan "muxtariyyət degil, xarabazar alacaqsınız!" demişdi!..

Böylə bir təhlükə qarşısında milləti müdafiə edəcək yalnız bir Gəncə qalmışdı. Gəncə öhdəsindən ağır bir vəzifəyi kəndi başına ifa edəmədigindən bittəbii getdikcə riştəyi-ümur əlindən çıxıyor, bolşevik yəd extisabına keçməyin yerlərdə dəxi şiddətli bir itaətsizlik və anarşi zühur ediyordu.

Bu surətlə həyati-təbiiyəsini təhdid edən bir təhlükəyə qarşı səltə və hakimiyyətini qəbul eləmiş Tiflis hökumətindən laqeydlik və ədəmi-müavinət görən Azərbaycan əfkari-ümumiyyəsində pək təbii olaraq bir cərəyan, bir meyli-siyasi doğuyordu: bu müşkül vəziyyətdən milləti qurtaracaq bir qüvvət vardı:

Türkiyə!

Ümidlər həp oraya idi. O qardaş millət gələcək, bizi düşmən əlindən qurtaracaqdı. Xəlqin bundan başqa bir ümidi qalmamışdı.

Halbuki məsələ o qədər də kolay həll olunur bir halda degildi. Kəndisini Rusiyadan ayrı felən müstəqil bir halda idarə etməkdə olan Zaqafqasiya Türkiyə ilə sülh əqd etmək

istədigi halda məqsədinə müvəffəq olamıyordu. Türklər 1914 sənəsi hərbindən əvvəlki Qafqasiya hüdudunun iqasını istəyən Zaqafqasiya hökumətinin Trabzona gəlmiş heyəti-mürəxxəsəsi "Brest-Litovsk" müahidənaməsinin tamamilə qəbulunu təklif ediyordular. Bu təklif üzrə Zaqafqasiya vəqtilə türklərdən bir təzminat müqabili olaraq alınan Kars, Ərdahan və Batum vilayətlərindən sərf-nəzər etməliydi.

Məsələ ciddiləşiyordu. Ermənilərlə gürcülər hərb etmədən Türkiyəyə təslim olmayız diyordular. Bir tərəfdən bolşevizm, digər tərəfdən də erməni və gürcü cənguluğu arasında qalan müsəlmanlar isə müşkül bir mövqedə qalıyordular. Məəmafiə əhvalın ciddiyyətini dərk edən Trabzon heyəti-mürəxxəsəsi erməni, gürcü və türk əzasının ittihadilə Türkiyə ultimatumunu qəbula qərar vermişkən, seymdə oturan qızğın qafalı menşeviklərlə müvazinələrini itirən daşnaksaqanlar hərbə qərar vermiş, müsəlmanlar isə bitərəf qalmışlardı.



**Bakıda Parlaman caddəsində**
**Məclisi-Məbusan dairəsi**

Hərb başlamış, Trabzon heyəti dəxi Tiflisə ovdət eləmişdi. Fəqət heyət Tiflisə gəlincəyə qədər hərb də adətən bitmiş, Batum süqut eləmiş, Kars dəxi əhatə olunmuşdu.

Artıq təhəmmül etmək mümkün degil idi. Hərb durmalı, sülh əqd olunmalı, Zaqafqasiyanın istiqlalı rəsmən elən edilməli, yoxsa biz ayrılıb kəndi başımızın çarəsinə baxiyoruz – deyə seymdəki müsəlman əzası son çarəyə təvəssül eləmişlərdi.

Bihudə yerə macərayə soxulmuş olduqlarını və Zaqafqasiya xəlqinin qətiyyən hərbə mühəyya olmadığını gözlərilə aydın görən gürcülər dəxi bundan başqa bir çarə qalmadığına qane olaraq cəngcu Qegeçqori hökumətini düşürüb yerinə sülhpərvər Çenkeli kabinəsini qoydular.

Batum müzakiratı başlandı.

Çenkeli türk tələbatının artmayacağına qane ikən həqiqət əksinə çıxdı. Batum və Karsda tökülən türk qanına İstanbul hökuməti xunbəha olaraq yeni bir takım ərazi tələb ediyordu. Axısxa, Axalkələk, Aleksandropol, Sürməli və Naxçıvan qitələri bu tələbləri təşkil ediyordu.

Eyni zamanda təhlükəyə məruz qalan azərbaycanlı qardaşlarına müavinət üçün Nuru Paşa ilə məiyyəti İran təriqi ilə Azərbaycana keçmiş, Gəncəyə varid olmuşdu.

O zaman müdhiş bir anarşi içində olan Gəncə Nuru Paşayı göydən enmiş bir xilaskar kibi tələqqi etmiş, xəlq kəndisinə tarixin nüdrətlərlə qeyd edə biləcəgi parlaq bir istiqbal yapmışdı.

Batum müzakiratı uzun sürmüş, gürcülər artıq Zaqafqasiya hökumətində qalmayı kəndi hesablarına zərərli görərək əl altından Almaniya ilə anlaşmışlar, mayısın 26-da Gürcüstanın

Zaqafqasiyadan ayrı, kəndi başına müstəqil bir cümhuriyyət təşkil etdigini elan eləmişlərdir.

Bunun üzərinə seymdəki müsəlman əzalar kəndilərini Azərbaycan Şurayi-Millisi elan edərək iki gün sonra mayısın 28-də dəxi Azərbaycanın istiqlalını elan, Fətəli xan Xoyski kabinəsini təşkil və müstəqilən türklərlə müxadinət müahidənaməsi əqd eləmişlər və məzkur müahidənamənin 4-cü maddəsinə binaən məmləkətin əmniyyət və asayişini iadə etmək üzrə Türkiyəyə müraciət edərək Azərbaycana ordu sövqünü istəmişlərdir[1*].

İyunun 15-də Azərbaycan Şurayi-Millisi ilə hökuməti Tiflisdən Gəncəyə vürud etmiş; 16-da əqd elədigi iki tarixi icalsında Fətəli xan Xoyskinin istefasını qəbul ilə təkrar kəndisinin rəyasəti altında 12 kişidən ibarət yeni bir hökumət təşkil və bütün ixtiyaratı məzkur hölumətə həvalə edərək kəndisini isə əhvali-fövqəladəyi nəzərə alaraq tətil eləmişdir.

Şurayi-Milli tərəfindən məmləkətin idarəsini əlinə alan hökumət bir an əvvəl Bakıyı istirdad edəcək, Məclisi-Müəssisanı toplayacaq, hürriyyətlərlə Azərbaycan istiqlalını mühafizə və ixtiyaratını yalnız 6 aydan gec olmamaq üzrə toplanacaq Məclisi-Müəssisana təslim edəcəkdi.

Nuru Paşa məiyyətindəki ordunun müavinəti ilə az bir müddətdə Bakı vilayəti xaricində olan bütün yerlər Azərbaycan hökumətinin əmrinə müti olaraq hər yerdə əmniyyət və asayiş bərpa ediliyor, anarşi dəf olunuyor, yalnız Bakı bolşevikləri 5-6 ay zərfində bulduqları fürsətdən istifadə ilə olduqca mühüm bir qüvvət təşkil edərək bəzən

---

[1] Batumda əqd olunan məzkur müahidə ilə türkləri dəvət edən məktubların surəti vüsaiq qismində.

müqabil təcavüzlər yapmaq surətilə şiddətli bir müdafiə hazırlıyorlar. Daha sonra bolşevik hökuməti menşeviklərlə daşnaqlar tərəfindən yapılan bir ixtilal nəticəsində süqut eliyor. Əvəzində direktoriya hökuməti təşəkkül eliyor. Bu hökumət ingilisləri Bakıya dəvət ediyor. Bunun üzərinə Türkiyədən yeni qüvvət cəlbinə lüzum görülüyor. Almanlar isə Qafqasiya məsələlərində müttəfiqləri Türkiyə ilə rəqabət edərək Gürcüstan yolu ilə türk əskərini buraxmıyorlar. Bundan dolayı dəxi Bakının istirdadı sentyabrın 17-nə qədər gecikiyor. Nəhayət, həqq yerini tutur. Altı ay bir əsarət dövrü keçirdikdən sonra qurban bayramının günündə Bakı təkrar kəndi sahiblərinin əlinə keçiyor.

Bakının istirdadı dəxi süqutu qədər qanlı, dəhşətli bir surət almışdır.

Azərbaycan hökuməti artıq kəndi paytaxtında idi. Fəqət Bakı məsələsi hala bitməmişdi. Bakının süqutundan bir az əvvəl almanlar Brest-Litovsk müahidəsinə zeyl olmaq üzrə bolşeviklərlə əqd elədikləri bir müahidə ilə Bakıyı Rusiyaya tərk eləmiş, müqabilində kəndiləri üçün neft imtiyazı almışlardı. Azərbaycanlıları son dərəcədə iğzab edən bu halı o zaman İstanbulda bulunan heyəti-mürəxxəsə rəisi surətilə Azərbaycan hökuməti cümhuriyyəti naminə Almaniya səfarət nəzdində protesto eləmiş "Bakısız Azərbaycan başsız bədəndir!" deyə azərbaycanlıların Bakıdan sərf-nəzər edəmiyəcəklərini bildirmişdim[1]

* * *

---

[1] Bu vəsiqə qismi məxsusimlərdə mündəricdir.

Bakının istirdadından sonra Azərbaycan hökuməti felən vücud peyda eləmiş, yalnız vəziyyəti-beynəlmiləliyyəsini mətin bir əsasə rəbt etmək məsələsi qalmışdı. İstanbulda toplanacaq mərkəzi dövlətlər konfransını dörd aydan ziyadə bəkləyərək oturan Qafqasiya cümhuriyyətlərinin heyəti-mürəxxəsələri nəhayət görmədən İstanbulu tərk etmək məcburiyyətində qaldılar. Fransa cəbhəsində alman ordusunun düçar olduğu həzimət, onu mütaqib Bolqariyanın təslim oluşu, siyasət aləmini tamamilə dəgər-gün etdi. Almaniya kümməsi yerinə İngiltərə nüfuzu qaim oldu. Türkiyə müttəfiqlərlə əqd elədigi mütarikə şəraitinə nəzərən Bakıyı ingilislərə təslim edəcək və bütün Qafqasiyadan çəkiləcəkdi.

Noyabrın 17-si bakılıların xatirindən çıxacaq günlərdən degildir. O gün türklər kəmali-surət ilə Bakıyı tərk eləmiş, İngiltərə qüvvəti şəhərə daxil olmuşdu. İngiltərənin Azərbaycan istiqlalına qarşı alacağı vəziyyəti şübhələr içində qaranlıq bir vəziyyətdə idi. General Tomsonun ordusu ilə bərabər Biçeraxovun dəstəsi dəxi şəhərə daxil oluyor, şəhər üzərində uçuşan qara qarğalar (ayroplanlar) Rusiya ordusunun təkrar kəndi toprağına gəldigini "Rusiya vətəndaşlarına təbşir" ediyordu.

İkinci gün İngiltərə komandanı Tomsonun bəyannaməsi nəşr olunmuş, o dəxi Bakıyı Rusiyanın bir hissəsi kibi tələqqi edərək yeni Rusiya hökumətinin razılığı ilə buraya gəldigini qeyd eləmişdi.

Böylə qaranlıq, şübhəli və qorxulu bir vəqtdə, bir zamanda ki, Azərbaycanı himayə edən türk ordusu, yalnız türk ordusu degil, Azərbaycan əskərləri dəxi şəhəri tərk eləmişlərdi, polis idarəsi ingilislərin əlinə keçmiş, Biçeraxovun dəstələri mütəhəkkimanə bir vəziyyətlə şəhərə doluşmuş hər kəsdə

bir qorxu və ümidsizlik hasil olmuşdu. İştə böylə bir zamanda Azərbaycan Şurayi-Millisi təkrar həyata ovdət eləmiş. Azərbaycan Məclisi-Məbusanını dəvətlə məşğul olmuşdu.

Dekabrın yeddisində "İsmailiyyə" binasının yamq binası yanındakı sabiq ünas məktəbinin qəribkarı binasında Azərbaycan Məclisi-Məbusanı mütəntən bir surətdə açılıyor. Üçrəngli bayrağımız başımızın üstündə ehtizaz edərək istiqlalımızın şübhə və əndişələr içərisindən qurtarmaq üzrə olduğunu təbşir ediyordu.

* * *

Bari-giran hökumət təkrar möhtərəm Fətəli xan Xoyski həzrətlərinin öhdeyi-dərayətlərinə həvalə edilmişdi. Fətəli xan Azərbaycanın vəziyyəti-siyasiyyəsini tovzih etdirmək kibi müşkül bir vəzifə qarşısında idi. Bu vəzifəsini o kəmalimərhərətlə ifa ediyordu. İngiltərə komandanlığı əvvəlki bəyanatnaməsinə rəğmən Qafqasiya məsələsinin sülh konfransında həll olunacağı ilə Azərbaycanda yeganə bir hökumət olaraq Fətəli xan Xoyski kabinəsini tanıdığını elan ediyordu. Daha sonra Azərbaycan hökuməti naminə Paris sülh konfransına ezam olunan heyəti-mürəxxəsə ingilislərin məğrifət və müvafiqətilə yola çıxıyor və hər növ müzahirat və müavinətə məzhər olacaqları vəd olunuyordu.

Nəhayət, şəhərimizdə bulunan Biçeraxov-Prejavolski ordusu Azərbaycan hökumətinin tələbi üzərinə paytaxtımızı tərk ediyor; kəndi doğma ordumuz isə şəhərimizə gəliyor; əhali əskərlərimizi sevinclərlə istiqbal ediyor.

Fətəli xan Xoyskini istixlaf edən Nəsib bəy hökuməti daha ziyadə bir ciddiyyətlə gəmimizin içində oturub da bizimlə döyüşməkdə olan fitnəkar qüvvətlərlə mübarizəyə başlıyor. Bolşeviklər tərəfindən elan olunan iqtisadi qılıqlı siyasi zabastovka kəmali-müvəffəqiyyətlə basdırılıyor. Rusiya sovet hökumətinin nümayəndələri ilə Denikin ordusunun casuslarını tovqif etməklə Azərbaycan hökumətində tələb olunan siyasi tovqiflər həqqini iadə və bilfel tətbiq etmiş oluyor.

Son günlərdə İtaliya heyəti paytaxtımıza varid olaraq məbusan və hökumət rəisləri ilə görüşərək istiqlaliyyətimizə müsbət bir nəzərlə baxdıqlarını bəyan ediyorlar.

## VI

Yuxarıdakı fəsildə biz böyük bir cild təşkil edəcək tarixi məqaləmizin hövsələsinə sığacaq bir tərzdə ixtisar elədik. Bu tarixin güzəran etdigi anlarda daha əvvəlki fəsillərdə zikr etdigimiz milliyyət fikri ilə hakimiyyəti-milliyyə davası müxtəlif xünuni-səfəhat keçirərək nəhayət xarici bir şəkil peyda elədi:

Müstəqil Azərbaycan Cümhuriyyəti!

"Seym" məclisi təşəkkül etdigi zaman "Azərbaycan"dan yalnız Türk Ədəmi-Mərkəziyyət "Müsavat" firqəsi bəhs eləmiş, İttihad, Sosialist bloku ilə Hümmət firqələri isə cəsarət edərək yalnız Zaqafqasiya ölçüsündə fikir eləmişlərdi.

Məclisi-Məbusan açılıncaya qədər kəza istiqlal fikri əleyhində olan cərəyanə hər firqədən ziyadə azərbaycançı "Müsavat" firqəsi məruz qalmış, "ilhaq" mərəzinin mikroblarını nəşr edən "dahilər" tir tərizlərini Azərbaycan istiqlalının

məfkurəçilərinə tovcih eləmişlərdi.

Məclisi-Məbusan açıldıqdan sonra məmləkəti təmsil edən müxtəlif siyasi firqə və məslək əhlləri sağdan tutub sola qədər Azərbaycan istiqlalının mücahidi olduqlarını bəyan etdilər.

Azərbaycan istiqlalı fikrən qazanıldı!

Siyasi bir fikir olaraq qəbul edilən istiqlal xəlqin imanına sinmiş, qəlb və vicdanına yerləşmiş bir zehniyyət halına dəxi gəlməlidi.

Məclisi-Məbusan iftitahında: "Bir kərə yüksələn bayraq bir daha enməz!" nidasını təqdirən dəhşətli bir tufan kibi qopan alqışları martın 12-də hürriyyət günü yad olunduğu zaman coşub-daşan türk xəlqinin parlaman qarşısındakı nümayişini, milli ordumuzun Bakıya vürudi günündəki böyük milli bir nümayiş şəklini alan o səmimi mənzərəyi, sonki tətil zamanında türk və müsəlman əmələlərinin cansipəranə bir surətdə göstərdigi o asari-həmiyyəti, ordunun keçdigi, bayrağımızın yelləndigi hər bir yerdə ixtiyar qarıların, qocaların ağzından eşidilən o qiymətdar dua və sənaları görən və nəhayət, 28 mayıs günündəki o bibənzər bayramı tamaşa edən müdəqqiq üçün istiqlal fikrinin artıq xəlqimizcə bir zehniyyət halma gəldigini görməmək qətiyyən mümkün degildir.

Millətimizin bilxassə kütləyi-ümumiyyəsini, sahibi-idrak demokratiyasını səmimi bir surətdə mütəhiss edən bu zehniyyət bərəkətindəndir ki, istiqlalımızın ən müdhiş düşmənlərindən tutub ən şübhəli dostlarına qədər bütün müxalif və müariz firqələrin dəxi istər-istəməz Azərbaycan zəminəsində duraraq müxalifətlərini o nöqteyi-nəzərdən yürütmək istədiklərinə şahid oluyoruz.

Əvət, Azərbaycan əvvəlcə bir mədəniyyəti-milliyyə davası, daha sonra bir firqəyə məxsus mücərrəd bir fikri-siyasi ikən, bu gün bütün millətin məqsədidir. Bu məqsəd xaricində millət artıq kəndisinə məsud bir həyat təsəvvür edəmiyor. Bu qədər bəlalara təhəmmül etmiş xəlq üçün Azərbaycan Cümhuriyyəti təşəkkül etmiş bir əmri-vaqedir!

Bu əmri-vaqeyə qarşı hər kəs təslim olmalı, ona hər kəs ehtiram etməlidir!

## VII

Bir əmri-vaqe halını almış Azərbaycan Cümhuriyyəti cahanşümul əhəmiyyətə malik olan paytaxtı, güna-gün sərvət mənbələri, mütəşəbbüs tərəqqipərvər xəlqi sayəsində Qafqasiya cümhuriyyətlərinin həpsindən müstəid həyat bir məmləkətdir. Yalnız vəqtilə "atəşi-müqəddəs" sayəsində cahan ziyarətgahı olan bu yurd imdi də "cazibədar" sərvət səyyaləsi ilə cahan tacirlərinin meydani-rəqabətidir. Burası ticari rəqabət meydanı olmaqdan əlavə bir də siyasi rəqabətlərin cövləngahıdır. Qafqasiya silsiləyi-cəbalinin təhti-təhəffüzündə bulunan Zaqafqasiya ərazisindən olduğu üçün məmləkətimiz şərqlə qərbi yekdigərinə qovuşduran ən qısa yolun güzərgahında vaqe olmuşdur. Bu nöqteyi-nəzərdən o gün cahanca da vase bir miqyasda vaqe olan çəkişmədə burası dəxi düvəli-müəzzəmənin hesablarını təsviyə edən müvazinə cədvəllərində mühüm bir ədəd təşkil edəcəkdir.

Cahangir dövlətlərin dünyayı təqsim etdiklərində Zaqafqasiya millətlərindən ötrü ayıracaqları hissə və hüququn nə kibi bir şəkil alacağı həqqində nikbinanə və bədbinanə ol-

maq üzrə müxtəlif təsəvvürlərdə bulunmaq mümkündür. Bu təsəvvürlərin heç birisindən Rusiyayı xaricdə buraxmaq olmaz. Rusiya hər nə şəkil ilə olursa-olsun təkrar buraya enmək istəyəcək; daha bundan min sənə əvvəl Bakı neftinə düşkün olan Rusiya bu gün ona göz yuma bilmiyəcəkdir. İngiltərə dəxi əsrlərdən bəri arzu elədigi Zaqafqasiya yolu üzərində təsisi-hakimiyyət olmasa da iqayi-nüfuz etmək əzmindən bir an fərağət etməyəcək; nəticədə bir müsariədir davam edib gedəcək. Fəqət nə Rusiyanın, nə İngiltərənin, nə də sair bir dövlətin bu ərzi-müqəddəs üzərindəki mənafei azərbaycanlının mənafei ilə müqayisə ediləməz.

Müasir bir azərbaycanlı üçün Azərbaycan Cümhuriyyətinin istiqlalı, onun hürriyyəti bir takım maddiyyatla ölçülür şeylərdən degildir. Bayrağındakı rənglərin mədlulu vəchlə bu yeni təşəkkül edən türk cümhuriyyəti aləmi-islamda təşəkkül edən ilk cümhuriyyətdir ki, milliyyət, beynəlmiləliyyət və müasirlik əsası üzərində müstənəd yeni bir tərzi-idarə qurmaq cəhdi-alisindədir. Bu cəhdindən bir tizə olsun nişan vermək üzrə Azərbaycan millətinin məknunati-milliyyəsindən birər nümunə olaraq bu məcmuə vasitəsilə təşhir ediyoruz. Burada millətimizin istedadi-fitrisini göstərəcək nümunələr adətən bundan bir əsr avvəl Bakı ərazisindəki axar altunun miqdar və əhəmiyyətini qətiyyən bugünki aləmşümul bir dərəcədə göstərəmiyən əlamətlərə bənzər. O zaman qara çırağda yakılmaqdan başqa bir şeyə yaramayan Bakı nefti bədə nasıl sənaye və ticarəti ilə pək ziyadə tərəqqi etmiş olan məmləkətlərin müasir bir mayeyi-həyatı ola bildisə, əminəm ki, eyni topraq üzərində yaşayan xəlqin fitrətində təbiətin bir möhübbəsi olaraq gizli qalan

istedad dünyayə "odunsuz yanar və sudan qorxmaz atəşi-müqəddəs"[1x] qədər əsli bir mədəniyyət əhd etsin:

- Azad Türk mədəniyyəti!

Vətəndaşlar, bu mədəniyyət naminə çalışalım, bir dəfə yüksəlmiş o üç boyalıləvayi-istiqlal və cümhuriyyəti başlarımız üstündə tik tutalım!

**M.Ə.Rəsulzadə**

***"İstiqlal" məcmuəsi, 28 may 1919, №1***

Ənva – növlər
Müvəzzəf – vəzifəli
Təviq – təxirə salma
Müzahir – nümayişçi
Həvari – köməkçi
Süluk – hərəkət tərzi
Müxadinət – dostluq
Visaq – müqavilə, bağlaşma
Həzimət – məğlubiyyət
Təbşir – muştuluq
Mütəhəkkim – hakim olma
Qəribkar – kimsəsiz
Bari-giran – ağır yük
Tovzih – izah etmək

---

[1] Qədim iranilərdə bu təriq ilə bir atəşi-müqəddəs münqəbəsi mövcuddur. O münqəbənin Bakıda Bayıl burnu qarşısında su içində yanan qaz həqqində varid olduğu xatirə gələr.

İstixlaf – öz xələfi hesab etmə

Təriz – etiraz etmə

Tovcih – üzünü bir tərəfə çevirmə

İftitah – açılış

Səyyalə – maye, axan şey

Təhəffüz – qorunma

Düvəl – dövlətlər

Müsairə – güləşmə

Mədlul – anlaşılan

Tovqif – tutulma

Tədafö – dəf etmə

Hətk – şərəfsizlik

Məvaşi – südlük heyvanat

Riştə – əlaqə

Məşrəb – xasiyyət

Sədədə – niyyət, məqsəd

Hədəs – yeni üzə çıxan

Səlah – sülh, asayiş

Qate – qət edən

Məskukat – sikkəli pullar

آذربایجان رجالندن:



رسول‌زاده محمد امین

جمهوریتک استقلالنی اعلان و ایلک آذربایجان حکومتنی تشکیل ایدن
آذربایجان شورای ملیسی رئیسی



# آذربایجان جمهوریتی

— I —

جغرافیا اعتباریله آذربایجان اسمنك یالکز ایران ولایتلرندن تبریزایله حوالیسنه علم اولدیغی معروف اولسه‌ده بو اسمك تاریخجه دخی یالکز بو ولایته منحصر اولدیغی ثابت اولمش حقیقتلردن دکلدر؛ تمامیله بو اسمك آذری تورکلرله مسکون بوتون یرلره شامل بر اسم اولدیغنه دلیل و ثبوتلر واردر.

بو خصوصده اثبات مدعا ایتمك ایچون محیط‌لر یازمق ممکن ایکن بز، جمهوریتمزه ویردیکمز آدی جغرافی بر مفهومدن زیاده قومی بر معنادن آلدیغمزایچون بو مسئله ایله پك اوقدرده مشغول اولمایه لزوم کورمه‌یورز.

مشترك بر دیل، یازی، ادبیات، عادات، عنعنات، و تاریخجه مالك اولمق بر ملت عامللرینی تشکیل ایدرسه هیچ شبهه‌سز که ارس نهرینك ایکی طرفنده ساکن؛ جنوبده تبریز، شمالده باکو منطقه‌سنده طوپلانان خلقك اکثریتی بر ملت واحده‌نك نامزدیدر. یوقاریده مذکور عامللرك وجودی ایله برابر بر جمعیت افرادینك کندی یرلیکلرینی حس و ادراك ایلمه‌لری، سوزك تام معناسیله، ملی بر وجوده دلالت ایدرسه، هیچ شبهه‌سز که، بوملت واحده نامزدینك ارسك شمالنده‌کی قسمی کندیسنی یلمش بر ملتدر.

بو عصرمزده‌کی تعریفات علمیه‌سی ایله قسماً ملت اولمغه نامزد و قسماده بر ملت اولمش خلقك معروف بر اسمی واردر:

— آذربایجان تورکی و یاخود آذری تورکلر.

کندی شیوهٔ مخصوصه‌سی ایله قونوشان آذربایجان تورکی مختلف شیوه‌لره مالك و اولدیغی یرلره نسبتاه مختلف اسملر طاشیان بیوك تورك ملتنك بر قسمیدر.

آذری تورکلرك حال حاضرده اوتوردیقلری یرلر من‌القدیم تورك خلقی ایله مسکون اولمشدر. کرك باکو، کنجه، ایروان ایله تبریز، مراغه، اردبیل، خلخال و سائره کبی ولایتلر و کرك مغان، آران، قاراباغ، قراداغ کبی مملکتلر دائما تورك خلقنك اوتوراغی و تورك خانلارینك اوثاغی اولوب؛ بو یرلر کندیلرنده برچوق تورك

سلاله‌لرینك ایریلی خرده‌لی حکومتلر قوردقلرینی، بللرله سلطنت سوردیکلرینی گورمشلردر.

«ایدیل» نهرینك «قوزغون دکز»ه دوکولدیکی برده بویوك بر سلطنت توران خزر تورکلری دها ٧٠ نجی عصرده قالمق صحراسی ایله آشاغی‌یه دوغرو اوزانمش. مغان دوزلکلرینه یایلمش، دها صوکره اونلاری دیگر تورك سلاله‌لری تعقیب ایله‌مشلردر. بویوك چنگیز ایله آقساق تیمورك حکوم بکلری کوربوزی ایله ارس حوضه‌سی جیحون ایله سیحونه بکزه. دیکدن توران کوچه‌لرینه اوتوراق ایتمش، سلجوق حکمدارلری ایسه آرق بوراسنی قطعی صورتده بر تورك مملکتی حاله قویمشلردر. سلجوقیلردن صوکره بو اراضی الدن اله کچمش مختلف حکمدار و سلاله ادارەسنده قالمشلار سه‌ده، بونلار اکثرا تورك اوروب، بوبو کلری متمحل اولدیقده، برلرینی، کوچوکده اولسه‌لر، یه برر تورك خانلقلاری دوتمشدر. مثلا اولارق بوراده حکم سورن آذربایجان آتا بکلری، قره قویونلی و آق قویونلو تورکمن بکلرندن اوزون حسن و قره یوسفلری گوسترمك اولار که کاملا تورك اوروغ و اویماقلارندن گلمشلردر.

صوك دفعه اولارق روس استیلاسنه معروض قالان دربند، قوبا، باکو، شکی، شیروان، قره‌باغ، گنجه، ایروان ونخجوان خانلارینك دخی آذربایجانلی تورك خانلاری اولدیغی معلوممزدر.

خلاصه تاریخك هرشده قالدیغی بر زماندن بری بورالرده کی قارلی داغلارده صوسز آرالمرده، یشیل اووالقلرله شبدیرم قایاقلرده، قوزغون دکزلرله یانار داغلارده، قشده حرارت، سفره سنده نعمت بله‌یی بو سنار برلرده، انسانك طبیعت طابعیتی اوراق زمانه‌سری الهی بر نوره مظهر اولان بو ارض مقدسه‌ده بر چوق

عصرلردر آغاق ایدن اونلار؛ مغان صحراسندن میل دوزیه، قالمق چولندن آران وادیسنه یایلان اونلار؛ شیروان سلسله‌سندن قره‌داغه جاپان، شاه داغك ته‌سندن سوه‌لان قزوسته قونان اونلار؛ کور اوواسندن قزل اوزه‌ن چولکه‌لرنه سوزه‌ن یه اونلار، یمی تورکلر اولمشلردر.

تورکلرك بورالرده کی حکمرانلقاری هندستان، خراسان، بغداد، ایران و مصرده اولدیغی کبی باشقه بر جنسدن اولان خلقه حکیری برصفت اولارق حکومت سورمکدن عبارت اولمامشدر. عثمانلیلردن باشقه اکثر تورك حاکملری حکومت ایتدکلری خلقه تمثل ایتمشلردر. آذربایجان تورکلرینك کتله اعتباریله؛ مانند ترکی مهمی اولان دیللرینی حالیله ساقلا ملری گوستریور که آذربایجانده کی تورك حکومتلری باشقه‌جنسدن برخلقه مسلط اجنبی بر حکومت عسکریه دکل، تورك خلقه اکثریته استناد ایدر بر حکومت ایمش. روس استیلا. سنه قدر عرب و ایران استیلاسنه رغما آذربایجان خانلقلارینك یاریم مستقل تورك خانلقاری حالنده قالمالری، حتی ایران آذربایجانك بیله تورك سلاله‌دن اولان بر ولیعهد واسطه‌سیله اداره اولونوشی بونی بر درجه‌یه قدر تایید ایتمزمی!....

هر نه قدر بوندان یوز سنه مقدم آذربایجان خانلقلری کندی‌بلکلرینی درك ایتمه دن، کندیسنی طابعیتی ملی بر سیما گوسترمه دن موقتلرینی ایرانك نفوذ معنویسنه، صوکره ده روسك قوت بازوسنه ترك و قضایه تسلیم اولیوردیه‌لرده، خلق، کندینه مخصوص ادبیاتی، شاعرلری، عاشق و درویشلری ایله حزن و مسرتنی کندی لسانی ایله ترنم ایدیور، کندی

ادراکی ایله بر وجود اولدیغنی، بلکه سزمه‌دن، سزدیریوردی.

اوت، رحله‌سنی اوستندن ایشه‌ین ضولیسی، کور اوغلی ایله باغری یانیق کرمه آغلایان عاشقلری، بو عاشقلرك یورك داغلایان سازلری ایله جوه‌لارك روحه سیان یایلری. جوجوقلرك سه‌وه سه‌وه ازبرله دیکری - اوشودی‌ه‌نری کندیسنی ایرانلی یاپان بو حلقك مدهش بر ضلالنده اولدیغنی کوستریور:

— یوق دگل، سیز تورکسگز:

دیوردی.

— II —

بو تورکلر آذربایجانی ایکی‌یه بولن آرس نهرینك ایکی طرفنده ساکن اولوب قسماً ایرانه شو و یا بو صورتله باغلی یم مستقل بر حالده یاشادیقلری زمان ظاهراً محکوم بر ملت دگل حاکم اولارق یاشیورلاردی. ایران تختنده اوتوران سلاله کندی جارندن بر تورك سلاله‌سی ایدی. ایرانی و ایران دائرهٔ نفوذنده اولان خالقلری خارجی دشمنلره قارشی جدیله مدافعه ایدن شاهزاده، ینه بر تورك شاهزاده‌سی ایدی. عباس میرزانك استناد ایله‌دیکی نقطه تبریز اولدیغی کبی، امید بلعلا دیغی قوه دخی آذربایجان تورکلری ایدی.

آذربایجان خلقی اداره‌جه کوردیکی آغر- لغی باشقه‌لرندن دگل، اوز جنسندن کوردیکی ایچون حقیقی محکومیتی، معنویاتجه تمامیله باشقه بر روح و یابانجی بر مدنیت محکومی اولدیغنی درك ایتمه‌یوردی. کیت گیده فارسلا- شیورده‌ی. خواص تحصیلی تمامیله فارسجه کو ریور، فارس تربیه‌سی آلیور، بر فارس کبی

آذربایجان رجالندن:



**طوپچیباشف علی‌مردان بك**
آذربایجان مجلس مبعوثانی رئیسی.

دوشونیور و کندیسنك دوغریدن دوغرویه ایرانلی اولدیغنی تصوّر ایدیوردی. خلقك حل و عقدینی الده بولوندیران بو خواص کبی معنویاتجه حاکم بولونان علما صنفی دخی عین روحده، عین تربیه‌ده، عین ذهنیتده ایدی.

فارس ادبیاتنه مهستی‌لر، نظامیلر، قاآنی و خاقانیلر کبی استادلر بخش ایدن بو آذربایجان خواصی یلك ضیمی ایدی که بر زمان عثمانلی سلطان مقتدری سلیمان قانونینك یاه آرقالاقبول ایله‌دیکی سعدی لسانی قارشیسنده اریوب کندیلکلرندن کچمش، تورك ایله تور کیجه

بوقاریدن آشاغی برباقشله باقمشلردی.

ایرانك او دهشتلی و جهانشمول ادبیاتی و او ادبیات سایه‌سنده کی قوتلی معنویاتی قارشوسنده تسلیم اولوب ده تمثل ایدن تورك خواصنك بالطبع عوام اوزرینه دخی بیوك تأثیری اولاجقدی. هم اولمشدی. تورك کلمه‌سی تورك خلقنك کندی دیلنده شایان حیرتدرکه تحقیری متضمن بر معنا یرنده استعمال اولونیوردی. بونك تمثیلاتی ایشیتدیکی حالده بیله کورمك ممکندر. «تورك‌ـ‌بچه» سوزینك عوامز آراسنده «ساده‌لوح» معناسنده ایشلندیکی، «تورك سوزی» تعبیرینك سطحی معناده سویلنن سوزلره علم اولدیغی، «تورك دیشکن» علاوه‌سنك سامعه‌یی تحقیر ایدن معنالره التباس ایدن کلمه‌لردن آیرلمایان بر ردیف حالنده کلمه‌سی ایشته او دهنیتك تأثیریدر. فنا تأثیر کندیلکنی غایب ایدن خواصك خلقه تلقین ایله‌دیکی «قدح نفس»دن حاصل اولمشدر.

خواصنك بو درجه‌ده تمثل ایتمه‌سی آذربایجانلیلری تحف بر ملت حالنه قویمشدی:

دیلی باشقه، یازیسی باشقه بر ملت!
ماورای ارس آذربایجانی حالا بو حالده‌در.
اوراده هر کس تورکجه سویلر، فقط عینی زمانده
یازیلری تمامیله فارسجه یازیلر.

فقط کندیلکندن کچمش خواص کیردیکی بو باتاقلغی یولك چیقلمز بر بیراهه اولدیغنی سزمدیکی حالده عوام بونده لاقید دکلدی. خلق غیر طبیعی اولان بو حاله عنصری بر صورتده مقابله ایدیوردی. تورك دموقراتیاسی کندیسنك . کیمسه‌نك سزمدیکی و اهمیت ویرمه‌دیکی. لاملشدیرلمه‌سنه قارشی قیام ایله‌مشدی. بو قیامك قهرمانلری ایسه خلق شاعرلری ایله دستانجی عاشقلر ایدی. لادری مصنفلرك یاراتدیغی «کوراوغلو»، «اصلی و کرم»، «عاشق غریب» و سائر بو کبی ادبیات، تورك ساقان عاشق سازلرینك روح نواز آهنکلری آلتنده آذربایجان تورك خلقنك قلبنه اویله سینیور، اویله یرلشیوردی که اونکله دکل فارسلك «نوش آفرین»ی، «رستم و سهراب»ی، حتی فردوسی ایله حافظی بیله رقابت ایده‌مزدی. او، اوز فردوسیسنی، اوز حافظنی، اوز سعدیسنی ـ دوغما تورك شاعرینی و روحندن خبر ویرن آذربایجان شعرینی آریوردی.

بو حرکت ویرسین که خواصك هپسی اوندان روکردان اولمامشدی. ایشته بو، دوغدیقلری محیطدن تمامیله روکردان اولمایان آذربایجان شاعرلری خلقك احتیاجی تعیین ایدرك تورکجه شعرلر یازمایه باشلامشلر، خلق ادبیاتندن علاوه یازی ادبیاتنك اساسینی دخی وضع ایله‌مشلردی.

بو اولدقجه آغر و مشکل وظیفه‌یی ایفا ایدن مشربلی تورك شاعرلری موفقیتله کوردیلر و موفقیت عظمتی بر تفصیل تحلیلی کندی باشنه مهم بر موضوع اولمقده صددمزك خارجنده اولدیغی ایله تقدیر اولونور. بز اوندن یالکز مدتاً حاکم ایکن معناً محکوم اولان خلقمزده معناً دخی محکوم اولمامق ایچون بر تشبث و حیات اثری موجود اولدیغنی کوسترمك ایچون اوثری اولارق بحثه لزوم کوردك.

شمالی آذربایجان روس تحت اداره‌سنه کچدیکندن صوکره، محدود اولسه‌ده، مالك اولدیغی سیاسی حقوقی تمامیله ایتیرمش. مادی محکومیتك بوتون آجیسنی دادمشدی.

اولکی اداره زماننده کوردیکی معنوی استیلای مشترك بر دین و یاقین بر روح تأثیری ایله بلکه ده سزمه‌یوب کیندیکجه فارسلاشان

آذربایجان تورکی، بو دفعه‌ده روسلاشدیرلمق سیاستنه معروض قالمشدی. فقط بو سیاستك بر آیاغی جیره باغلی اولدیغندن و تمامیله یابانجی برروحه مالك بولوندیغندن طبیعی ایدی که خلقك مدافعهٔ نفس حسی دها زیاده فیجقلیور. اونی دها سرعتلی بر صورتده کندیسی دوشونمکه وادار ایدیوردی.

بر وقت حکومت طرفندن تعیین اولونان ملالره «دفتر ملاسی»، روس اشقولنده اوقویان بك بالالریه دخی «روس بالاسی» دیین خلق کندی حدسیله دویدیغی روسلاشدیرمق سیاسته بیلدیکی کبی مقابله ایتمشدی. او، دفتر ملاسنه قارشی اوز آخوندینی، میسترسنوا اشقولنه‌ده مکتبخانه‌سنی قارشی قویمشدی.

خلقك حسی دوغرو ایدی. او آخوندنك حربی و مدرسه‌ایله مکتبك استقلالی ایچون یك حقلی و پك معقول بر مبارزه‌ده ایدی. او، مادتا محکوم اولدیغنه راضی اولمش، فقط معناً دخی محکوم اولمق ایسته‌میوردی.

فقط خواص، ینه یانگلمشدی. وقتیله فردوسی‌نك طمطراق اسلوبی، سعدی‌نك حکمتی، حافظك تغزلی قارشوسنده بایلان «میرزا»، بو دفعه‌ده لرمنتوفك روحی، پوشکینك اسلوبی، تولستوینك فلسفه‌سه وورغون بر «اوجیتل» ایدی.

سنه‌لر کچدی. اشقول اوجیتلی ایله مکتب معلمی آکلاشامادیلر.

قارشیلاشمش میرزا کبی روسلاشمش اوجیتل دخی خلقك حدسا دویدیغی مطلبی بر چوق زمان درك ایده‌مه‌مشدی. نهایت برچوق ییراهه‌لردن کچدیکدن، مکتب و مدرسه‌لره قارشی بیلزوم، دها دوغروسی، بی اصول ماره‌لردن سوکره «اوجیتل» آرتق اصل مطلبی آکلادی. بیلدی که: سعدی‌یی‌ده، تولستویی‌ده تورك خلقنه اوکرتمك، تورکی اولادلاره آشنا ایتمك هم لزوملی، هم فائده‌لیدر. فقط بونکله برابر تورکی کندی سعدیسندن، کندی تولستویندن محروم ایتمك اولاماز.

سعدی‌یی، تولستویی و سائر دنیا مشاهیر ادبنی آکلامق ایچون کندی فضولیلرینی، نابیلرینی — گوزه نه‌قدر کوچوکده گورونسه — سیدلرینی، صابرلرینی اوکرنمه‌لیدیلر.

بو زمین اوزرنده روس مکتبی واسطه‌سیله مدنیت حاضره‌یی آز چوق درك ایتمش عرفا ایله خلق آراسنده یکدیکرینی آکلامق دوری باشلادی.

آرتق آذربایجان تورکنك اویانمق زمانی گلمشدی. و زمانك بزه نه‌لر ویردیکینی دکل، مجموعه‌مزك دیگر قسمنده متخصص آرقداشلارمز سیزه عرض ایده‌جکلردر. بن ایسه یالکز:

مالك اولدیغمز معاصر ادبیات، متعدد مطبوعات، رنگین تیاترو، پارلاق موسیقی، منشئ تجار، گوزی آچیق عمله، سیاسی فرقه، محرر، آقتور، مهندس، معمار، حقوقشناس کبی صنعتلر، دکورایله الهٔ مخصوص مکتبلر وسائر بو کبی مؤسسه‌لرمز بزه، محکوم ایکن آرتق حاکم اولماسنه تمیزده بر ملت اولمشدق دیره.

اوت، دها آذربایجان امونه‌ر ای میرزا فتحعلی آخوندوف مرحومله باشلایان معاصر ادبیات هوسی، حسن‌بك ملکوف مرحومك «اکینچی» غزته‌سی ایله مطبوعات ملیه تأسیس و دوامنه حصر اولونان املر، جمعیت خیریه یاپسی ایچون یوندان قرق ییل اولنه عائد اولان تشبث، نهایت ملی ادبیات، ملی مکتب طلبلری، شیخ الاسلامله مفتی و سائر آخوندلرمزك نتیجه دکل.

اتخابه اولوشنی ایسته‌مك، دها چارلق زماننده مکتب و مدرسه اصلاحی یولنده توالی ایدن اویتمز توکتمز دعوالر یاننده بر شیی دگل. یالگز بر دعوا ایدی:

— حاکمیت ملیه دعواسی

## III

حاکمیت ملیه دعواسنك ۱۹۰۵ نجی روسیه انقلاب صغیری نتیجه‌سنده حاصل ایله‌دیگی قازانجلر وار ایدی: ملی مکتب، ملی مطبوعات، ملی جمعیتلر تأسیسی حقی، جزئی مساعدات.

بو مساعده‌لردن استفاده ایله بویوك محاربه عرفه‌سنده و انقلاب کبیرك پاطلادیغی زمانده آذربایجان تورکی، روسیه‌ده کی سائر تورکلرله برلکده آرتق سیاسی ادراکدن محروم، آرزوی ملیسی انکشاف ایتمه‌مش لال بر کتله حالنده دگل، حیاتنی ابراز ایده‌جك واسطه‌لره مالك دیری و یاشامق ایسته‌دیگی حس ایتدیرن بر وجود حالنده ایدی.

اون سنه‌لك کوچوجك بر نفس، آذربایجان تورکی متعدد مطبوعاته، مختلف جمعیتلره، سیاسی فرقه و تشکیلاته، زماندن، مکاندن آکلار خادملره مالك ادراك صاحبی برجمعیت حالنه قویمشدی.

بو جمعیت، ۱۹۱۴ سنه‌سنده پاطلایان عالمشمول محاربه‌نك آلت اوست ایله دیگی معنا و قیمتلری بویوك بر حاسلقله تعقیب ایدیور، طوپلارك کورولتوسی ایله برابر قوپان «ملتك حقوقی مقدسدر!» نداسنی دورت قولاغله دیکله‌یور، محارب بولونان بوتون دولتلره منسوب رجال آغزندن صیق صیق ایشیدیلن بو شعارك صمیمیته دگلسه‌ده، بو بویوك حقیقتك ایستر ایسته‌مز اعلان طرف ایدیله‌جگنه ایمان ایدیوردی؛ بو ایمانك ترجمانی اولنق اوزره دها

آذربایجان رجالندن :



**فتحعلی‌خان خویسکی**
جمهوریتمزك اولنجی حکومت رئیسی.

روسیه انقلابی ظهور ایتمه‌دن، محاربه‌نك قانلی سانسوری هر یازیلانی بلا امان یوزمقده، بالخاصه تورك کلمه‌سی ایله تورکجیلك مسلکنه قارشی دشمانه بر وضعیت آلدیغی بر زمانده «آچیق سوز» غزته‌سی بوقدریدا مذکور ایمانه ترجمان اولارق یازیوردی که:

«دهشتلرینه شاهد اولدیغمز بویوك محاربه، بویوك بر حقیقتی عصرمزك ملیت عصری اولدیغنی اثبات ایتدی.

«دنیانك خریطه‌سی عربه دکنه‌جك، دیمه جبرله قاریشیق برجمله ایمدی، برچوق آغزلاردن ایشیدیلمکده‌در. دنیا خریطه‌سنك آلاجه‌ی یکی شکله وطنداشلارك فداکارلغی، دولتلرك تشکیلاتی،

و اوردولارك عظمتی ایله برابر، هیچ شبهه بوقدرکه وضوح و رسوخ پیدا ایتمش ملیت مفکوره‌لرینك‌ده بویوك تاثیری‌وار واولاجقدر.

«اوزینی آوروپاجه بیلوب‌ده استقلال ایچون معین بر ایده‌آل(مفکوره)سنه‌یی ملت شبهه‌سزکه بویوك بر قوت تشکیل ایده‌ر. شبهه‌سزکه سوزك تام معناسیله دنیله‌جك قدر، کوه ایکن طوپلارك حاکم اولدیغی حرب میدانلرنده تاثیرسز قالمایان بوقوت یاشیل یاهوتلی‌یارشیق ماصه‌سی اوزرینده‌ده اساسلیجه بر تاثیر یاپاجق.

«هرحالده‌کی عالم‌طرف آزچوق سوروتجلی بر دنجلك وجوده گتیرمك ایسترسه، عصرك وجدانلری اوزرنده اك چوق تاثیر اجرا ایدن قوتی‌ـ ملیت مفکوره‌سنی‌ـ اهمال‌ایده‌مز! بوتك‌بوبانه اولاجغی آرار که‌جك‌صلحی حقنده سوزسویله‌ین آوروپا متفکرلرینجه‌ده تصدیق اولونمقده‌در. صاحبونه منسوب سیاسارجه ملت اساسنه رعایت ایتمیه‌جك، ملتلرك حقوقنی گوزدتمیه‌جك بر صلح عقدنامه‌سی‌چوق‌چکمزـ برتیار وسوروتجلی بردنجلك تامین ایده‌مز.

«حقوق طبیعیه‌سی پایمال اولمش بر ملت باقی قالنجه‌یه‌قدر آوروپا موازنهٔ دولیه‌سی‌حقیقی وسوروتجلی برصلح یوزی گوره‌مکدن محروم قالاجغی کبی، کندی وطنداشلاری آراسنده اوگی دوغمالق گوزه‌دن بردولتده حقیقی بر قوته سوکنمیه‌جك، مترقی وقوتلی بر تشکیلاته مالك اولمیاجقدر.

«دیمك که معین برمفکوره‌یه واکثر افرادینجه مشخص برغایهٔ آماله مالك اولان ملتلر، دولتلر آراسنده‌کی مناسباتده اهمیت قازاندقلری کبی، دولتلرك داخلی سیاستلری اوزرنده‌ده بویوك تاثیرلر اجرا ایده‌جکلردر. بوصورتده‌آیری آیری ملتلر برملت اولارق یاشایه بیلمك‌ایچون هرشیدن اول اوزلرینی‌بیلمه‌لی. معین فکر واملرلاطرافنده برلشه‌رك بویوك برمفکوره‌یه، غایهٔ حیاته هدف اولاجق اوانشبقلی یلدیزه صاحب اولمالیدرلر. چونکه متحد برروح و مشترك برغایه‌یه مالك اولمایان ملتلرله یکی اساسلر اوزرینه قورولاجق حیات حسابلاشمیه‌جق وبویله برصلاحدن محروم قالان جماعتلر کومسه‌یه سوز ایشیتدیره‌ـ میه‌جکلردر!»(*)

(*) ۲ اوقتابر ۱۹۱۵ «آچیق‌سوز» نومره ۱.

بویوك محاربه‌نك آذربایجان یورکلرنده دوغوردیغی امید بویله‌ایدی.

ملیت بردنیسینك غالب گلمجگنه باغلانمش بر امید!

***

ـ روسیه ایمپراطورلغنك ۱۹۱۷ نجی ییلده قارپات، بولشا و بالتیق ساحللرنده‌کی او گوروتمز طلوبیتی، دنیانی صارمش آتشین حرب زنجیرنك مهم حلقه‌لرندن بریسی قرمش اولدی.

روسیه‌یی تضییق ایدن چاریزمده‌خی‌بوحلقه‌ایله برابر سقوط ایله‌مشدی. بویوك محاربه بویوك بر انقلاب دوغورمشدی.

دنیانك آلتیدن‌برسنه صاحب‌اولوب‌ده ۷۲ ملتی قاهر بر اداره آلتنه طوپلامش اولان بویوك روسیه ایمپراطورلغنده ظهوره گلن بو انقلاب کبیر ایکی دورلو نتیجه ویره‌جك، ایکی‌مهم مسئله‌یی حل ایده‌جکدی؛ بوقسه انقلاب کندی روحی و کندی طبیعته ضد اولوب اوزیله برابر روسیه‌یی‌ده قهر ایده‌جکدی:

روسیه‌انقلابی‌محکوم‌مستعمره‌حریت‌ویره‌جکی کبی، محکوم ملتلری‌ده قورتاراجقدی.

بوتك‌ایچون ایدی که مارت انقلابی هر کسدن زیاده کویلی و عمله‌لرله، محکوم‌ملتلر بویوك برهیجان و سرورله قارشیلامش، همان کندی حقوقلرینك استحصالی ایچون بویانمادن تشکیلاته باشلامشلاردی.

مجلس مؤسسان بر آن اول طوپلاجق، کویلولره طوپراق، عمله‌لره ایش، ملتلره‌ده مختاریت ویره‌جك ایشته عمومی برآرزو!

مجلس مؤسساندن کیم نه گوزله‌یور؟

اجتماعلر، قورولتایلار، قرارلر، قطعنامه‌لر هپ بونی تعیین ایله‌مکده...

قافقاسیا داخل اولدیغی‌حالده روسیه‌تورکلری

«آذربایجان رجالندن: حسن بك آغایف
مجلس مبعوثان رئیسی معاونی»

دخی بو خصوصی اهمال ایتمه‌یورلردی:

نیتکوده آپریلك ۱۵ نده ایلك دفعه اولارق قفقاسیا مسلمان قورولتایی طوپلانیور. قورولتای هر شیدن دها اول و هر مسئله‌دن دها قزغین بر صورتده آزاد روسیه‌نك آلاجغی مطلوب اولان شکل اداره‌یی مذاکره ایله آشاغیداکی قراری چیقاریور:

«آ- قفقاسیا مسلمان قورولتایی، ملی سیاسی مقصدلر حقنده کی مسئله‌یی مذاکره ایده‌رك مسلمان قوملرینك منافعنی اك زیاده تأمین ایدن روسیه شکل اداره‌سینك محلی فه‌ده‌راسیون اساسی اوزرینه قورولی جمهوریت مجتمعه اتام اولدیغنی قبوله قرار ویرر.»

«ب- اسلام دیننده اولان بوتون قوملرك روحانی و مدنی ارتباطنی نظره آلارق قفقاسیا مسلمان قورولتایی بوتون روسیه مسلمانلرندن اوتری وضع قوانین صلاحیتنه مالك عمومی بر اداره تشکیلنی لازم گورور»

بو قطعنامه گونلرجه دوام ایدن مناقشه نتیجه‌سنده برنوع ائتلاف نتیجه‌سی اولارق متحداً قبول ایدلمش ایدی. مسئله برطرفدن تورکجیلر، دیگر طرفدن‌ده اسلامجیلر ایله سوسیالیستلر آراسنده ایدی. فه‌ده‌راسیون اساسینی مدافعه ایدنلر تورکجیلر ایدی که خصوصی اولارق آذربایجانه محلی مختاریت طلب ایدیورلردی. معارضلر ایسه یالکز خلق جمهوریتی ایله اکتفا ایدوب ملیت مسئله‌سنی ایسه محلی دگل، مدنی مختاریت صورتیله حل ایدیورلردی.

آپریلی متعاقب مای آیده موسقواده بوتون روسیه مسلمانلرینك عمومی قورولتایی انعقاد ایتمشدی. روسیه تورکلرینك بوتون انواعنی تمثیل ایدن بو بیك مرحلی بیوك قورولتای عینی موضوعده بوسطرلری قارالیان محررك اسلامجی-سوسیالیستلره قارشی مدافعه ایتدیگی معروضه اوزرینه واقع اولان شدتلی مناقشه‌لر نتیجه‌سنده روسیه‌نك ملی-محلی مختاریتلر اوزرینه قورولی قوشماطلق جمهوریتندن عبارت اولماسی طلب اولونیوردی. بو طلب روسیه مسلمانلرینك

ایسدن ایکی قونك طاشماسندن حاصل اولمشدی: بر طرفدن محروم صنفلر، دیکر طرفدن‌ده محکوم ملتلر باش قالقزوب حقلرینی طلب ایسه‌یورلردی. گوپلوطوبراق، عمله ایش، وه‌لیکوروس اولمایان ملتلرده حق و محتاریت ایسته‌یورلردی.

بوبوك انقلاب بو طلبلرك هپسنه حساب ویرمك مجبوریتنده‌ایدی. مع مافیه بونلارك فوقنده دیکر مهم بر طلب دخی دوریوردی که بوده بر آن اول حربی بیترمك ایدی.

حکومت موقته، بالخاصه که‌ره‌نسکی حکومتی انقلابی، حربی موفقیتله بیترمك ایچون بر وسیله اولارق قوللانمق ایسته‌دی. خطرناك بر تجربه یاپارق انقلاب اوردوسی‌ایله دشمنه جدی بر هجوم حاضرلادی.

بو صورتله بوتون جدیت و فعالیتی «ظفر نهائی» یه صرف ایدن انقلاب حکومتی بالطبع انقلابك طلب ایندیکی اساسلی مسئله‌لرك حلنی تأخیر ایندیرمك مجبوریتنده‌ایدی. بومجبوریت ایسه هرجهه‌ده، هم‌ده عقبه‌ده بیوك بر حرکتی موجب اولیوردی.

افکار عمومیه، انقلابك اورتایه آتدیغی «الحاقسز و تضمیناتسز صلح» «ملتلره تعیین مقدرات حقی!» شعارلری‌ایله طوبراق و عمله مسئله‌لرینك بر آن‌اول قوه‌دن فعله گتیرلمه‌سنی طلب ایدیور، حکومت ایسه هر شیئی مجلس مؤسسانه تعویق ایدیوردی.

بو تعویق سیاستی بر طرفدن بالشه‌ویزمی، دیکر طرفدن‌ده ملی‌جریانلری قوتاندیریوردی. بالخاصه که‌ره‌نسکی‌نك فلندیا سه‌یمی‌ایله‌اوکراینا راداسنه قارشی آلدیغی طور تهدید ایله آلمانیا

آذربایجان رجالندن:



یوسفبکلی نصیب‌بك
لاحق هیئت وکلا رئیسی.

اوردویه موفقیتسز بر صورتده اجرا ایله‌دیکی هجوم آرتق بالشه‌ویزم ظهورینه میدان ویرمشدی.

بالشه‌ویکلر که‌ره‌نسکی حکومتندن قاچاق بر حالده، مخالفت وضعیتده ایکن «هر نه قیمته اولسه‌ده صلح!» شعارینی اورتایه آتمقله عسکرلری، «هر ملت روسیه‌دن آیریلمه قدر آزاددر» عنوانیله‌ده بوتون ملتلری قازانیور؛ حکومت موقته‌نك خطاریندن کندی‌حسابلرینه فائده‌لر چیقاریورلردی.

نه قدر که (لهنین) گیزلنمك مجبوریتنده، یعنی مرکزده کی بالشه‌ویکلر ضعیف بر حالده

ایدیلر. اوقدر اطرافده کی بالشه‌ویکلر مختاریت شعارلی فرقه‌لره مظاهر گوروئیورلردی. از جمله باکوده اولان بالشه‌ویکلر رفیقلری وحتی دشمنلری منشه‌ویکلرله جداً مبارزه ایتدیکلری حالده، منشه‌ویکلرله بردورلو یاقین براقمیوب‌ده «گوزوم چیقه‌ی» یه سندیقلری تورك ماتچیلرینه بقلالشیورلردی. «مساوات» فرقه‌سی، مثلا، عمله شوراسی منشه‌ویکلرده ایکی بورژوا برفرقه‌دیر، دیه یاقین براقلمه‌دیغی حالده منشه‌ویکلرجه منشه‌ویکلره، تمسیله‌ری ترجیح ایدیلیوردی.

پتروغراددە حکومتی الە آلیر آلماز (۱۹۱۷) بوتون مسلمان ملتلرینه بر خطابنامه نشر ایله‌مشدی. بو خطابنامه‌سنده اوه اساست اتده بوتون شرقه، یعنیلره بر ادا ایله حریت و استقلال وعد و تأمین ایدیوردی.

فقط بالشه‌ویکلر مخالفتدن حاکمیته کیچنجه «سوزیله ایش آراسینده نه درجه‌ده بوی بوبرشن اوزاق اولدیغی بر دفعه ده تحقق ایدی.

«تعیین مقدرات حقی» هر کسه دگل، زحمتکشلره‌ددر، دیه اونلره یکی تفسیرلر چیقدی. آذربایجان مختاریتی ده «وطن شمندگل «حمالرك بکلرك آغالرك‌ددر» دیه ال دگیشدی. (۱۹۱۸) مرکزده یونسی بر گیشه‌لر دیکجه ولایتلرده کی حواریلری همان بر ده هر یرلیجی و بر درجه قدرده بویوك روسیه‌جی بر شکل و سیما آلمیه باشلادیلار. محکوم ملتلر قره روسیه‌دن ایشتدیکلری تهدیدلری بو کره‌ده قزل روسیه‌دن ایشیدیورلردی.

آذربایجان مسئله‌سنده ایسه بو تهدید معین بر شکل آلیوردی. بالشه‌ویکلرنه‌سیده لیسکی ناموجی، سله بایدی بر مقاله‌ده دیوردی که: «آذربایجانك مختاریتی تورك بورژوازیسنك مختاریتیدر.» وفقط‌سه مختاریته نه روسیه بورژوآزیاسی نه‌ده روسیه دموقراتیاسی راضی اولابیلره

«آذربایجان مختاریتی ایسته‌ین مساواتچیلر نتیجه‌ده خرابه‌زار بوله‌لار.» بالشه‌ویکلرك باکوده «مساوات»ه‌نسبت آلدیقلری طورتهدید، تورکستان، قریم، اوکراینا، قفقاسیا کبی ولایتلرده آرتق عملی‌مجادله وقتال شکلی آلمشدی.

آذربایجانلیلر قده‌لرك دیلندن «نه‌ایسترسه‌گز ویرەلم، بکر آیشرون یاریم آطه‌سه طوقونما یکره» دیدیکلرینی اشتملر ایدی. بالشه‌ویکلردن دخی هیچ تکلیفی ایشیتدیلر. فقط بر کره مختاریت فکرینه سلوك ایدن ملت آرتق عزمندن دونمه‌جکدی. بالشه‌ویکلرك مختاریته قارشی خرابه‌لرله تهدید ایدن مقاله‌سنه قارشی «آچیق سوز»: «شبکه‌ده مقدردر که مختاریتمزی خرابه زارلر قیمته آلالم. مقدرات تاریخه‌دن‌الینه که بوبون قاچیرمق اولماز» دیه منو کلالیه برصورتده مقابله ایدیوردی: «آلته بر (۱۹۱۷) دخی چیقدر بزم مختاریتمز حقنده «ده کرت» ویرره کانیه‌سی ایله عزم ملتك بویوك مشکلاتله اولسه‌ده آخری ایسته‌دیکنه نائل اولاجغنی امید ایدیوردی.

آرتق مسلمانلره بر دوست کبی گورونن سوللرك‌ده ساغلار کبی حاکمیت بروراله بر مقصد تعقیب ایله‌دیکلری میدانده ایدی.

***

شابه‌ده قوتلی بر تشکیلاته مالك اولان منشه‌ویك فرقه‌سنه قارشی دیکیش دونه‌دورامیان بالشه‌ویکلر باکونك دائما بر انقلاب حالنده بولونان عمله محلی اولدیغی استفاده ایچون بورایه کوچمشلردی.

باکوده یرلشمك و بوراسی کندیلرینه ابدلی بر استادگاه یاپماق ایسته‌ین بالشه‌ویکلر بالطبع یرلیلرك ملی بر حکومته دوغرو گیدن مقصدلریله مبارزه ایده‌جکلردی. بونك ایچونده اونلار تورکلره قارشی مبارز بر وضعیتده اولان ارمنیلر ایله تشریك مساعی ایده‌جکلردی.

نهایت اوله چیقدی. بالشه‌ویکلر قوللندیقلری داشناقلارە نسبت خطا حرکاتلرینی دگیشدیرمیورلر. بالعکس ملی مسلمان قوشونلرینه و مساوات فرقه‌سنه قارشی بر طور مخالفت آلدیلر.

بو آرالق، تفلیس ـ باکو یولنده‌کی آنارشیدن ناشی باکوده طوپلانوب قالان ناممنون عسکرلرك وجودی دخی بالشه‌ویکلر طرفندن ماهرانه بر صورتده استفاده اولنیوردی. مهم حادثه‌لر حاضرلانیوردی.

(شائومیان) اداره‌سنده‌کی «ساوه‌ت» لك مسلمانلره قارشی دوتدیغی سرد مسلك کوندن کونه شدت ایدیوردی. کوزلری قاغنده ارمنی ملی عسکرلرینك آزادانه گزدیکنی کورن خلق، مسلمان فرقه‌سی ضابطلرینك توقیف اولوندیغی و فرقه نفراتنك تعرضه دوچار اولدیقلرینی کوروب بالطبع غلیانه کلیوردی.

بو صورتله کوندن کونه چوغالان یاندیریم آخری بر فتنه اودی ایله دوتوشدی. بو یانغین ۱۹۱۸ نجی ییل مارت آینك ۱۷ سندن ۲۱ نه قدر دوام ایدن قانلی مارت حادثه‌لرینه سبب اولدی.

مارت حادثه‌لری بالشه‌ویزم مسلکنك هر یانده یاندیردیغی داخلی وطنداش محاربه‌سی شکلندن چیقاریلوب عادتا ملی بر قتال شکلنی آلدی. یانده داشناقسوتیون اولارق ارمنیلر تورکلردن انتقام آلمغه باشلادیلر. بونون معناسی ایله بر ارمنی ـ مسلمان قانی یوزی ویردی.

«حکم ایتمك ایسترسن آیبر» شعارینی بالکر (نیقولای) لرك جانشینلری دگل، (لهنین) لك قومیسارلری دخی کندیلرینه دستور اتخاذ ایتمشلردی.

تجربه‌لر: قانلی چاریزمك حاکمیت منبه دعواسنه ویردیکی جواب ـ قانلی قتاللر ایدی.

قزل بالشه‌ویزمك جوابی ده عینی ماهیتده اولمقله برابر ده‌ها فجیع و ده‌ها غدار بر شکل آلدی.

(شائومیان) سوزینی دوتمشدی: «اسماعیلیه بناسی، آذربایجان فکرینك او قاینار اوجاغی ایله «آچیق سوز» اداره‌سی برر خرابه‌زاره دوندرلمشدی.

## ۷

«خون ارباب همتّ غرق ایدر ظالملری
مشعل افکار احرارانه سونمز جوشله!»

آذربایجان تورکلکنك بویوك انقلاب طرفندن اعلان اولونان تعیین مقدرات حقندن استفاده‌یه قالقدیغنی بالشه‌ویکلر باکو کوچه‌لرینی قانلره غرق ایتمکله بوغمق، و اسماعیلیه بناسنده یاقلان حریت مشعلی او محتشم بنانك کوللری آلتنده سوندیرمك ایسته‌دیلر.

باکو بوقدر مدهش بر جنایته معروض قالدیغی زماندن آذربایجان فکر و ایده‌آلنی تمثیل ایدن مسلمان مبعوثلری تفلیسده ایدیلر. او زمان تفلیسده بر طرفدن تورکلر ایله مصالحه‌یی، دیگر طرفدن‌ده روسیه‌دن ابدیاً آیریلارق اعلان استقلال ایلەمك مسئله‌سنی تدقیق و مذاکره ایتمکده اولان ماوراء قفقاس سه‌یمه‌سی انعقاد ایدیوردی.

ماوراء قفقاسیا مسلمان مبعوثلری دخی سه‌یمده اشتراك ایلەیوردیلر. دانا باکو فجیعه‌سی بالشه‌ویکلرك مسلمانلرك سه‌یمده‌کی استقلالجو یولنه قارشی بر انتقام و جزای سیاسی ایدی.

ماوراء قفقاسیانك بالشه‌ویزم آنارشیاسندن مدافعه‌سنه قرار ویرن آذربایجان مرکز سیاسی‌سی (باکو) نك تفلیسدن معاونت کلمه‌سنه حقه مالك ایدی. بونون آذربایجان آتیجیلارنده اشتراکی ایله تشکل ایدن «سه‌یم» مجلسی ایله ماوراء قفقاسیا حکومتنك معاونته انتظار ایدوب دوریوردی.

فقط هیهات! آذربایجانلی سه‌یم اعضاسنك بویوك صدا ایله باغیروب چاغیرماسی تفلیس

حکومتنك حقیقی صاحبلری اولان کورجو منشه ویکلرینی بریدنك قملدانامادی. کورجستان داخلنده کی بالشه‌ویزمی بیك شدت و قهرلرله باصدیران بو آغالر، باکویه قارشی قورو اعلان حرب ایله ایتمك ایستمه‌دیلر. نتیجه ملی مسلمان قومیته‌سنك تشکیل ایله‌دیکی استخلاص اوردوسنه ایسه مایونلارله پاترون، اوقلرله یوله‌میوت و بر قاچ طوپ وعد ایدیلرسه‌ده، وعدلرینی دونمادیلر. تفلیس مطبوعاتی ایسه باکونك آذربایجان «باشی بوزوق» لری ایله استردادینه آچیقدن آچیقه اعتراض ایتدی. نهایت هر قسم بهانه‌لری بیتردیکدن صوکره کورجی سرآمدان سیاستی «قارشیمزده تورك تهلکه‌سی وار، کن کندیلریله احتمال که عقد اتفاق ایتمك ضرورتنده بولونجقمز بالشه‌ویکلرله مناسباتمزی بوزامایز» ایضاح واعتراضنده بولندیلر.

اونجه مسلمانلارك انتقامندن، تفلیسك منافع وسندن قورقان عصیانکلر باکو مدافعی بر وضعیت آلمش ایکن، صوکره جسارت پیدا ایتمش، بالشه‌ویك باکو کنجه‌یه دوغرو حرکت ایله‌مك قصدیله دوشمش ایدی. بو حرکته ایلك اول شماخی، دها صوکره لنکران، سالیان، قوبا، کوردمیر، نواحی و سائر قصبه‌لر معروض قالمش، شهرلر خاك ایله یکسان، عرض و ناموسلر هتك، مال و مواشی غیمت ایدلمشدی.. کنجه بالذات تهدید اولونیوردی، دیکر طرفدن دخی قره‌باغ ارمنیلری باکو بالشه‌ویکلری ایله برلشمك اوزره بر پلان حاضرلامقده، آذربایجانك آتش و قلعه سلسله مجبور ایلامك بلاسی حاضرلامقده ایدی.

معلوم آ. شاتومیان «محاربت دکل حرابه‌زار آلاجقکز!» دیمشدی!...

بوله بر تهلکه قارشوسنده ملی مدافعه ایده‌جك یالکز بر کنجه قالمشدی. کنجه عهده‌سندن آغر بر وظیفه‌یی کندی باشنه ایفا ایده‌مه‌دیکندن بالطبع کیندیکجه رشته امور الندن چیقیور. بالشه‌ویك یه اغتصابه کیجه‌یین برلرده دخی شدتلی بر اطاعتسزلك و آنارشی ظهور ایدیوردی.

بو صورتله حیات طبیعه‌سی تهدید ایدن بر تهلکه‌یه قارشی سلطه و حاکمیتی قبول ایله‌مش تفلیس حکومتندن لاقیدلق و عدم معاونت کورن آذربایجان افکار عمومیه‌سنده بك طبیعی اولارق بر جریان، بر میل سیاسی دوغیوردی: بو مشکل وضعیتدن ملتی قورتاراجق بر قوت واردی:

تورکیه!

امیدلر هپ اورایه ایدی. او قارداش ملت کله‌جك، بزی دشمن الندن قورتاراجقدی. خلقك بوندان باشقه بر امیدی قالمامشدی.

حالبوکه مسئله اوقدرده قولای حل اولونور بر حالده دکلدی. کندیسی روسیه‌دن آیری فعلا مستقل بر حالده اداره ایتمکده اولان ماوراء قفقاسیا تورکیه ایله صلح عقد ایتمك ایسته‌دیکی حالده، مقصدینه موفق اولامیوردی؛ تورکلر ۱۹۱۴ سنه‌سی حربندن اولکی قفقاسیا حدودنك اقامتنی ایسته‌ین ماوراء قفقاسیا حکومتنك طرزوته کلمش هیئت مرخصه‌سنه «برهست لیتووسق» معاهده‌نامه‌سنك تمامیله قبولی تکلیف ایدیوردیلر. بو تکلیف اوزره ماوراء قفقاسیا وقتیله تورکلردن بر تضمینات مقابلی اولارق آلنان قارص، اردهان و باطوم ولایتلرندن صرف نظر ایتمه‌لیدی.

مسئله جدیله‌شیوردی. ارمنیلر، کورجیلر حرب ایتمه‌دن تورکیه‌یه تسلیم اولامایز، دیوردیلر. بر طرفدن بالشه‌ویزم، دیکر طرفدنده ارمنی و کورجو جنکجولغی آراسنده قالان مسلمانلر ایسه مشکل بر موقعده قالیوردیلر. مع مافیه

